# Molla Nəsrəddin



# ملّا نصرالدّین

Hazırladı: Cavid Ağa

اغآ دیواج :یدالرضاح

1 rəbiələvvəl | Beşimci il | 28 февраля 1910

ملا نصر الدين

№9 Qiymәti 12 qәpik. МОЛЛА НАСРЕДДИНЪ Цена 12 k. № 9




– Siz Allah, bir insaf ediniz: Məgər mənim bətenim zahirimə bənzəmir?

Litoq. S.Bıxova

# Əkrəm bəy əfəndi həzrətlərinin bir şerinə bənzətmə:

Bu da bir şeri-firqeyi-digər.

---

Ey tələbkari-qəhvəvü qəlyan,
Eylə mollaya diqqət ilə nəzər.
Olsa hər yerdə nəzir, ya ehsan,
Bil ki, mollaya eylənibdi xəbər.

---

Ol tüfeyli ona, onunla həman
Eylə xeyrat olan məkanə güzər,
Sədri-məclisdə tut özün də məkan,
Et plov nimçəsini zir-zəbər,
İstə bişərm nimçeyi-digər.

---

Oldu vəqta ki, cofi-mədən pür,
Başla latayilatına bibak.
Ağzını aç saçıb da gövhər, dürr,
Et də ənbani-fitnədanını çak.

---

İstəsən söylə, istəyirsən hür,
Eyləməz əhli-məclisin idrak.
Söylə biməğz, biədəb hər cür,
Öylə ki, molla olmasın qəmnak.
Al dübarə bədieyi-digər...

---

Müstəbidanə eylə sərdməqal,
Mürtəceyanə etgilən təqrir.
Olma hürriyyəti-ülumə məyal,
Köhnəxahani etgilən təqdir.
Vəzi molladan olgilən xoşhal,
Eyliyən dəmdə arifi təkfir.
Olsa mülki-vətəndə izmihlal,
Etməsin zərrə qəlbinə təsir.

---

Eylə fikri-vədieyi-digər
Ol həvəskari-nəğmeyi-digər
Bu da bir şeri-firqeyi-digər.

*Kefsiz*

---

**MƏNFƏƏT**

«Molla Nəsrəddin»in müsəlmanlara zərəri dəxi aşkardır, bu barədə heç bəhs də ola bilməz.

Amma bir para müsəlman qardaşlara jurnalımızdan hərdənbir böyük mənfəət də hasil olur. Belə ki, məsələn, Tiflisdə bu axır vaxtlarda iranlıların Ənсüməninə üzvlər seçiləcək idi. Məlum şeydir ki, bizlərdə o kəslərə rəy verirlər ki, Allah bəndəsi, mömin və müqəddəs adam ola (və qayda belədir və belə də gərək olsun).

Bəli, seçkiyə bir-iki gün qalmış intixaba durmaq fikrində olanlar düşdü-



lər bazara və başladılar camaat içində danışmağa ki, Molla Nəsrəddin dinə sataşıb. Əlbəttə ki, bir-iki günün içində bu çığır-bağır salan adamlar o qədər hörmət qazandılar, elə bil ki, İranı düşmənlərdən mühafizət etdilər. Bir-iki gündən də sora seçki əmələ gəldi və Molla Nəsrəddin»i əldə dolandırıb lənət oxuyanların hamısı Əncümənə üzv seçildilər.

Tiflis baqqallarından sora islam dinini müdafiə edənlərin bir neçəsi də Vladiqafqazda tapılıb. Bunların da bicliklərini sora xəbər tutub yazarıq.

Sözümüz orasındadır ki, «Molla Nəsrəddin»in islam aləminə hədsiz zərəri ola-ola, hərdənbir bəzi şarlatan qardaşlara mənfəəti də olur.

*Cırcırama*

---

## ÜZR

Biz, şiələr, müsəlman qardaşlardan üzr istəyirik.

Əhvalat bu qərar ilədir ki, indi, doğrudur, yer üzündə o qədər vüquat əmələ gəlir ki, mümkün deyil baş qaldırmayaq və öz varlığımızı bildirməyək.

Bir tərəfdən İran və Osmanlı vaqiələri, bir tərəfdən Qafqazda özümüzə aid olan bəzi əhəmiyyətli məsələlər, bir tərəfdən «əsl rus» kimi bədxahlarımızın bizləri istəməməyi və məsələn, Peterburqda müsəlmanların məscid tikmələrinə etiraz eləməkləri, qeyrə və qeyrə.

Lakin biz şiələrin böyük üzrümüz var və müsəlman qardaşlardan xahiş edirik ki, bizi bağışlasınlar: dərdimiz o qədərdir ki, onlar ilə həmrahlıq edə bilmirik.

Əhvalat bu qərar ilədir ki, Tiflisdə müqəddəs David küçəsində olan «Molla Nəsrəddin» bu axır nömrələrində «Hülyətül-müttəqin» kimi müqəddəs kitabın sahibi Məhəmmədbağır ibn Məhəmmədtağıya sataşıbdır; yəni demək ki, bizim «dinimizə» sataşıbdır.

Və bu da bizə elə bir böyük dərd olub ki, dəxi Peterburqda Pruşkeviç də yadımızdan çıxıb və bu gün-sabah qonşularımız gərdənimizə minəcəkləri də yadımızdan çıxıb.

Və bu xüsusda müsəlman qardaşlardan üzr istəyirik, dəxi özgə işə məşğul olmağa vaxtımız yoxdur.

*İmza: Şiələr*

---

## VƏZ

Cənab Əqdəsi-ilahinin məşiyyəti-mübarəki əlaqə bağlayıb, müsəlmanlar ümumən dalı qalıb, ona ibadət eləməkdən başqa ayrı işlərə məşğul olmasınlar. Əgər müsəlmanlar tərbiyətli olsalar, başları qarışar dünya işlərinə, xəllaqi-əhədiyyəti yaddan çıxardarlar. Elm və tərbiyət xəllaqi-aləmin məşiyyətilən çox ziddir. Nə qədər qəzetlər yaza və jurnallar bağıra, heç mümkün deyil Allahın məşiyyəti təğyir tapa və müsəlman camaatı tərbiyətli olmuş ola; beşgünlük dünya işlərin daimi behişt nemətlərinə, hurilərə, qılmanlara tərcih verə.

Hətta mən sizə xəbər verirəm, bu məşrutəni də cənab Əqdəsi-ilahi sizə verib ki, imanınızı möhkəm eləyib, axirətinizi ibad eləyəsiniz. Müsəlmanların karxanaları və maşınları övrətləri siğə eləməkdir ki, gecə-gündüz işləyib «lailahə-illəllah» deyənləri yer üzündə çoxaltsınlar. Hər bir dəfə «lailahə-illəllah» demək tamam firənglərin şəhərlərindən artıq abadçılıq sizin üçün axirətdə mühəyya elər. Bu firəngilərin ağlı yoxdur. Belə ki, ağlın tərifində buyurublar: ağıl ibarətdir o şeydən ki, ibadət oluna onlan Allaha və kəsb oluna onlan behişt. Pəs bu surətdə təklifinizi bilin, azmıyın və çalışın və «Molla Nəsrəddin»i oxumuyun, vəssəlam!

*İmza: Vladiqafqazda Molla İsmayıl Həsənzadə*

---

## TƏZƏ QƏZETƏ ELAN

Bir məmləkətin əhalisi tərəqqi və təaliyə üz çevirdiyi vaxtda qəzetəyə ehtiyac görülür. Buna səbəb Batum, Qars və Cəvarə məxsus bir qəzetə nəşr etmək fikrinə düşdük. Məsləkimiz və məqsədimiz məktəb, maarifdən bəhs etmək deyil, zira məmləkətə lüzumu olmayan hadisat ilə mötəbər müştərilərimizə sıxıntı vermək istəmirik.

Məsləkimiz məhz ticarətə xidmət etməkdir. Qəzetimizin mündərəcatı bundan ibarət olacaq:

1) Kola, Ərdahan, Busxov və Türküstandan və Qarabağdan sovrulub gecə açıq və gündüz gizlin satılan malın məzənnəsi.

2) Bəylər, ağaların dul qızlarını ərə verib aldıqları hədiyyənin hesab və kitabı.

3) Müdərris, molla, bəy, xülasə ağalarımızın dərəyəti, bəylərimizin nəcabəti və üləmamızın kəramətindən müsaidə olduqca yazmağa cəsarət olunacaqdır.

Müdiri-məsul: Gündüz yuxulayan.

*Baş mühərrir: Gecəgəzən*

---

## MİLLƏTPƏRƏSTLƏR

Yer üzündə «Teymurxanşura» adında bir qəsəbə var. Burada çox millətpərəst və maarif yolunda canlarını və gözlərini müzayiqə etməyən adamlar var.

Məsələn, poçt gələn kimi həmin millətpərəstlər axtarırlar görsünlər ki, kimə qəzet və ya jurnal gəlir. Bəli, raznosşik qəzetəni, ya jurnalı gətirib verdi sahibinə, bu heyndə elə bashabas düşür ki, guya Aşqabad millətpərəstləri Mərvdən gələn əziz qonaqları yola salmağa tələsirlər. Xülasə, bunu ərz eləmək istəyirəm ki, hərçənd Teymurxanşuraya iki cüt bir tək qəzetə və jurnal gəlir, amma, maşallah, oxuyanların sayı iki yüzdən artıqdır. Bu

**Pruşkeviç və yoldaşlarının yuxusu**

**O sözü danışma, kafər olarsan**




Həqiqəti-hal. Что видимъ мы на яву.

nəyə dəlalət edir. Buna dəlalət edir ki, genə Naxçıvana və Ordubada nisbət Teymurxanşura Amerika şəhəri kimi tərəqqi tapmış bir yerdir. Allah bərəkət versin.

*Butaylı*

---

**BEŞ ARVAD**

«Ağcabədi» deyilən kəndin yaxınlığında bir balaca kənd vardır. Bu kənddə bir mömin kişinin dördcə arvadı var imiş. Sora birin də alır. Olur beşcə. Camaat bu işi bilib ona məzəmmət edib deyirlər ki: a kişi, bu nə işdir ki, edibsən? Şəriətdə beş arvad saxlamaq olmaz. O da cavab verib deyibdir ki: molla ilə, qazi ilə dost olandan sora nəinki beş arvad, bəlkə on beşini də saxlamaq olar. Xülasə, onun qohumları görüblər ki, bunun axırı pis olacaqdır, ona deyiblər: indi ki, sən bu beş arvadın hamısını saxlamaq istəyirsən, gərək gedəsən qazi ağanın xidmətinə, o belə işlərə çarə edər. Kişi əlli manat da cibinə qoyub yola düşür, tainki gedib cənab qazi olan yerə yetişir.

(Mabədi va.r)

---

**GÜLMƏYİM GƏLİR!**

Gördükcə qiylü qalınızı gülməyim gəlir,
Etdikcə seyr halınızı gülməyim gəlir.

---

Gördükcə elmə, sənətə sizdə bürudəti,
Duyduqca qəlbinizdəki kini, küdurəti,
Bir yanda ittifaqı, o bir yan xüsuməti,
Bir yanda da zəvalınızı, gülməyim gəlir,
Etdikcə seyr halınızı gülməyim gəlir.

---

Gördükcə hökmran sizə alimnümaları,
Zülmata sövq edən cühəla rəhnümaları,
Düzdi-təriqi-rast olan kəcnümaları,
Həm də yeni xəyalınızı, gülməyim gəlir,
Etdikcə seyr halınızı gülməyim gəlir.

---

Söylə, bica deyilmi edəm xəndə, qəhqəhə?!
Etdikcə sən sitayiş özündən də əbləhə?!
Həm aldanıb quru sözə, bisud pəhpəhə
Verdikcə mülk-malınızı, gülməyim gəlir,
Etdikcə seyr halınızı gülməyim gəlir.

---

Cadu, duanəvis ilə etdikcə iftixar,
Etdikcə tasbaz və cindara etibar,
Əfsaneyi-qələndərə olduqca guşdar,
Açdıqca molla falınızı gülməyim gəlir,
Etdikcə seyr halınızı gülməyim gəlir.

---

Gördükcə sizdə sirqətü qətlü dənaəti,
Pamali-zülm, ərzi-hüquqi-cəmaəti,
Həm bir tərəfdə zöhd, namazü itaəti,
Həm xirqə, həm də şalınızı gülməyim gəlir,
Etdikcə seyr halınızı gülməyim gəlir.

---

Bir yanda pəndi-moizə, bir yanda girüdar,
Hər yan nifaq, təfriqə, hər yanda intihar,
Minbərdə molla, yerdə də cibgiri-hiyləkar,
Gördükcə infialınızı gülməyim gəlir,
Mollayi-bikəmalınızı gülməyim gəlir,
Həm söhbətü sualınızı, gülməyim gəlir,
Etdikcə seyr halınızı gülməyim gəlir.

*Məşədi Sijimqulu*

---

**TELEQRAF**

Bakı idareyi-bələdiyyəsinə. İyirmi yeddi milyon istiqrazı nə cür fənn ilə etdiyinizi bizə də öyrədin, çünki bizim də şəhər atalarına çox para lazımdır.

*İmza: Xarkov idareyi-bələdiyyəsi*

Bakı idareyi-bələdiyyəsinə. Bizim də üzvlərə bir çox para lazım olduğu üçün idarənizə müraciət etməyə məcbur olduq. Rica edirik istiqraz etdiyiniz iyirmi yeddi milyonun nasıl bir fənn ilə etdiyinizin yolunu bizə də öyrədəsiniz.

*İmza: Tiflis idareyi-bələdiyyəsi*

---

**AX KEÇƏN GÜNLƏR**

Atalar sözüdü: keçən günə gün çatmaz, calasan günü günə. Doğrudan da, hanı qədim vaxtlar! Rəhmətlik dəli Haşım demişkən hanı Molla Qəni dövrü? Mağıl onda xeyir-bərəkət var idi, hər yanda şeyxi, mütəşərri davası olurdu. Hər məclisdə bəhslər açıb, çığır-bağır salıb, kitabı bir-birlərinin başlarına çırpırdılar. Yaxşı böyük-böyük mollalarımız, imanlı qazilərimiz və dindar vaizlərimiz var idi və hər biri özünü bir tərəfə vurub plovu yeyib, çayı içib merac məsələsi, bərilələm davası və şəqqül-qəmər möcüzəsi deyirdilər. Və bir-birlərini gözəl həcv eləyirdilər və deyirdilər:

Sən baxgilən o Rəhim xan iblisə,
O nəcisə, o murdara, o pisə.
Hirsin yemir, yoldan dönür Tiflisə,
Çatla hərif, vayındı bundan sora
Məhəmmədəli tayındı bundan sora.

Vallahi, heç yadımdan çıxmır o günlər ki, hər il məhərrəm qabağı Molla Qulam adında bir nəfər Həmədandan dəstəsilə gəlib gözəl-göyçək uşaqları Ələkbər,

Qasim şəbihi bəzəyib, bığıburma boynuyoğunları da İbn-Ziyad və Şümr şəbihi qayırırdı və camaatımız da ağlamaqdan qəşş edərdilər. Və heç unutmuram o vaxtları ki, Ağabala dərviş gürzə-gürzə ilanları bazar dalına töküb oynadardı və sarı kağızda yazılmış ilan-əqrəb duasını paylardı camaata. Novruz bayramında təhvil saxlayıb, təhvil suyunun üstündə dava-mərəkə salardılar və ağsaqqal, qarasaqqal o təbərrük suyu qapış-qapış elərdilər.

Şəhərimizdə olan «Qara daş»ın, «Xudu divanə»nin, Xədiceyi-güvaranın ehtiramı var idi. Arvad-kişi o yerlərə nəzir deyərdilər, ziyarətə gedərdilər. Qocalarımız, cavanlarımız uzun börk qoyardılar, təppəçuxa və cübbə geyərdilər... Amma heyf və genə heyf olsun ki, indi zəmanə dönüb, xeyir-bərəkət götürülüb, imanlı və dindar kişilərimiz ölüb, şeyxi-mütəşərrinin əvəzinə xuliqanlıq və məşrutəçilik çıxıb, möcüzat yerində politika danışılır, təppəçuxalar pidjak-jilet olub, uzun börklər qazançılanıb, saqqallar qırxılıb, başlar urusu qoyulub, uşaqlar urus paltarı geyib urus işqolasına gedirlər. İlan, əqrəb duasının əvəzinə qəzet, jurnal çıxıb, cavanlarımız oxuyub yoldan, izdən çıxırlar, get-gedə mollalarımızın ehtiramı xalq arasında əskilib, camaatımız şəbih çıxartmağa, ilan oynatmağa birəğbət olublar, «Qara daş»a baxan olmur, Xədiceyi-güvarada çıraq yandırmırlar, Xudu-divanəyə ziyarətə getmirlər. Gör işlər haraya müncərr olub ki, bu yaxınlarda Ordubad, Naxçıvan, Şərur, İqdir uyezdlərinin qəsəbə camaatının tərəfindən deputasiya İrəvana yığışıb şərt qoyublar ki, hərgah mollalar, rövzəxanlar, xanlar, bəylər, hacılar bu il məhərrəmlikdə şaxsey dəstəsinə yapışmasalar və başların yarmasalar, onlar da yapışmasınlar, yarmasınlar. Bunlar deyirlər ki, hərgah bu işlər yaxşı işlərdirsə, qoy böyüklərimiz də eləsinlər. Deyirlər niyə bəs vaizlərimiz, rövzəxanlarımız pulu yığırlar və əyanlarımız və hacılarımız məclisin yuxarı başında əyləşib, çay içib qəlyan çəkirlər? Bircə biz vurub başımızı dağıdıb, həftələr ilə naxoş olub kəsbikardan qalırıq və onlar isti məsciddə əyləşib şirin-şirin söhbət eləyirlər, amma biz soyuqda-qarda şaxsey gedib zatülcənb oluruq...

Ax keçən günlər! Zəmanə dolanıb, küfr aləmi tutub, məxluq dindən, məzhəbdən dönübdür. Kaş belə rüzgarı görməyəydik.

*İmza: Cüvəllağı*

---

## ƏLİF BEY

Allah rast saldı.

Bir ay bundan müqəddəm Aşqabadda bisavad tacirlər qərar qoydular ki, gecələr saat 9-dan 11-dək Müzəffəri işqoluna yığışıb dərs oxusunlar. İyirmi günün içində hıqqana-hıqqana əlifnən bey hərfini güclə öyrəndilər. Hansı bir şeytan oğlu şeytan gedib naçalnikə deyib ki, «bunlar buraya yığışırlar politika söhbəti danışmaqdan ötrü». Naçalnik də yüz nəfər kazakla gəlib orada olan adamların adını yazıb və buyurub dağılsınlar.

Doğrudan Allah rast saldı, yoxsa bisavad tacirlərdən Rusiya hökuməti üçün böyük xəta baş verəcək idi.

---

## POÇTA QUTUSU

Bakıda «Dəvəboyun»a: «Komandir» məqaləsindən bir mətləb çıxarda bilmədim.

Bakıda «Şair»ə: «Təraneyi-yavəguyana» ərəb dilində yazılıb. Hərçənd şerlər yaxşıdırlar, amma türkcə yazılmayan yazıları çap etmirik.

---

Balaxanıda «Kəbleyi Feyzüllah»a: «Rəhim xanın məktubu» adında şeriniz bizə çatmayıb. Məlum olur ki, əvvəlinci kağızınız da bizə yetişməyib. Məktubunuza cavab yazıb göndərmişdik Bakıda haman şəxsə ki, yetirsin sizə. O kağızımıza cavab gözləyirik.

---

Gəncədə «Nadinc»ə: Şerlərinizi oxuyanda adamın başı qaşınır. Necə ki, asnasda qumarbazın əli gətirməyəndə başının qaşınması tutur.

---

Dərbənddə «Kələ Dərbəndli»yə: Sadıq Əminovun avtomobili barəsində yazdığınız məqalə çox örtülüdür. Bir az açıq yazsanız çap edərik.

---

Ürgəncdə «Çalata»ya: Çox da qoçbaz, qumarbaz, mollabaz və balabazlarınızı tərif etmə: Qafqazdan xəbərin yox, ay biçarə.

---

İrəvanda «Yoldaş»a: Kağızınızı imzasız göndəribsiniz (yəni imza da olsaydı çap olunmayacaqdı).

---

İrəvanda «Dərdmənd»ə: Çap olunmayacaq.

**_Müdir və baş mühərrir: Cəlil Məmmədquluzadə_**


Vali həzrətləri: Ağalar, bir əhəmiyyətli məsələnin müzakirəsi üçün sizi buraya dəvət etmişəm.

Təbrizdə əyaləti-kübra


– Gədə, bax gör kimdir telefonu çağıran.



– Cənab vali, məgər burada sizdən də savayı hakim var ki, telefon ilə buyururlar ki, bu saat buradan dağılaq?
– Bəli, bəli ağa, burada yeddi hakim var.
Təfsili həmin nömrədədir.

ملا نصر الدين

№10 Qiyməti 12 qəpik. **МОЛЛА НАСРЕДДИНЪ** Цена 12 k. № 10




Персидское училище: 1-е отделение
İttifaq məktəbində. Əvvəlimci şöbə.

Litoq. S.Bıxova

## ƏDƏBİYYAT

Altmış illik ömrüm oldu səndə bərbad, Ərdəbil!
Bir də namərdəm əgər etsəm səni yad, Ərdəbil!

Zənn edirdim mən bütün aləmdə İrandan səva
Bir fərəhabad yer yoxdur o samandan səva.
Övrət olmaz hüsndə Fatma, Tükəzbandan səva,
Var imiş Rusiyyədə min-min pərizad, Ərdəbil!
Bir də namərdəm əgər etsəm səni yad, Ərdəbil!

Ey vətən, huri görürdüm səndəki övrətləri,
Derdim ol hurilərin sənsən yəqin cənnətləri.
İndi heyranam baxıb gördükcə bu löbətləri,
Hər birində başqa ləzzət, başqa bir dad, Ərdəbil!
Bir də namərdəm əgər etsəm səni yad, Ərdəbil!

Haliya Bakudayam, Baku demə bir xüldzar,
Xassə dərya sahili, bir löbətistani-tatar,
Hər tərəf ağ, çağ «madam»lar bir-birindən gülüzar.
Türfə dilbər, töhfə bir şey, yaxşı bir zad, Ərdəbil!
Bir də namərdəm əgər etsəm səni yad, Ərdəbil!

Min mənim tək kablayı bir Sonyanın dildadəsi,
Min mənim tək pakdin bir rumkanın üftadəsi.
Min mənim tək möminin bilməm nolub səccadəsi,
Bəndəlik qeydin qırıb olmuşdur azad, Ərdəbil!
Bir də namərdəm əgər etsəm səni yad, Ərdəbil!

Beş degil, on beş degil, hər yan baxırsan var madam,
Ev madam, mənzil madam, balkon madam, talvar madam,
Sirk madam, qəstin madam, passaj madam, bulvar madam.
Müxtəsər əqlim çaşıb, ey dadü bidad, Ərdəbil!
Bir də namərdəm əgər etsəm səni yad, Ərdəbil!

Gərçi İrandan çıxarkən başqa idi niyyətim,
Niyyətim kəsb idi, vardı kəsbi-karə qeyrətim,
Qeyrətim razı deyildi ac dolansın külfətim.
Yox gözümdə indi nə külfət, nə övlad, Ərdəbil!
Bir də namərdəm əgər etsəm səni yad, Ərdəbil!

Bəs ki, artır bunları gördükcə hər dəm rəğbətim,
Rəğbətim artırsa da, lakin qovuşmur həsrətim,
Həsrətim bir şeydir ancaq düzəlmir halətim.
Halətim təskini-nəfsə qılmır imdad, Ərdəbil!
Bir də namərdəm əgər etsəm səni yad, Ərdəbil!

Qorxudurdu çıxmamışkən ölkədən qürbət məni,
Çulğayıbmış qəflətimdən vəhşətü dəhşət məni,
İndi bu gördüklərimdən mat edib heyrət məni.
Özlüyümdən çıxmışam, əfsus!.. Fəryad!.. Ərdəbil!
Bir də namərdəm əgər etsəm səni yad, Ərdəbil!

Tazədən bərgəşt edib bir də cavan olsaydım, ah...
Şıq geyimli bir cavani-xoşnişan olsaydım, ah...
Bu pərilərlə doyunca həmzəban olsaydım, ah...
Dəhrdə beş gün yaşardım xürrəmü şad, Ərdəbil!
Bir də namərdəm əgər etsəm səni yad, Ərdəbil!

*Kablayı Feyzullah,*
*Nazimi: Ağlar Güləyən*



## İRS

İrs iki qisimdir.

Yaxşı, ali imarət, gözəl bağ, içində növ-növ meyvə ağacları, evin içində hər qisim əşya.

Və belə də ola bilər ki, birisinin atası ölən gündən üç gün sora borc sahibləri gəlib deyələr ki, «... çıx evdən, buranı atan bizə satıb».

---

İranı biz indi o halda görürük ki, əgər «borc sahibləri» gəlib dururlar iranlıların başının üstündə və deyirlər: «Çıxın buradan, buranı atalarınız bizə satıblar».

Allah cəmi vəfat edib gedən atalara rəhmət eləsin! Amma söz burasındadır ki, lazımdır atalara təfavüt qoymaq: Bəzi atalara ki, övladlarının fikrinə qalırlar, bunlara bir cür rəhmət oxumaq lazımdır, bəzi atalar da deyirlər: «övladın canı cəhənnəmə», bunlara da bir cür rəhmət oxumaq lazımdır.

Amma təfavütü gərək olsun.

---

Bu məsələyə, necə ki, lazımdır diqqət eləmirik. İranlılar yapışıblar Molla Nəsrəddinin yaxasından və elə bilirlər ki, «Molla Nəsrəddin» olmasaydı ingilis hökuməti İrana bac verəcək idi. Ta demirlər ki, xeyr, baba, vallah, tallah belə deyil. İran çoxdan satılıb. Əgər hirsiniz cuşa gəlib, axtarın mərhumların qəbrlərini tapın və bir balaca daş yerdən götürün durun qəbrin baş daşının üstündə və səkkiz dəfə dıqqıldadıb Hafizin bu şerini Bayatı-Şiraz havası ilə oxuyun:

Dərdü qəm on kəsi ki, mərdi-üqul,
Nə berahü, nə şivei, nə üdul.
Bamədadan ki, mah həfti-həsar
Nə zəli, tısbağa, çalar səni mar.

Yəni, ey rəhmətliklər, siz ki, burada qəbrin dəriçəsindən indi huri və qılmanlar ilə zəbərcəd dənələrini sayırsınız, nə rəvadır ki, borc sahibləri bizi vətəndən çıxardırlar? Allah sizə «rəhmət» eləsin.

---

Hünər hünər üçündür. Hünər bir Allah üçündür, bir də o kəs üçündür ki, İranı satan atalarımızın qəbrini nişan verə. Vallah, bir az fikir eləmək lazımdır. Biz Məhəmmədəlidən inciyirik ki, niyə Təbrizdə göyçək uşaqlara qara geydirib, məhərrəmlikdə göndərirdi məscidə ki, şam yandırıb düzsünlər taxçalara, məgər məscid mütrüb yeridir?

Yox, yox, Məhəmmədəlidən nahaq yerə inciyirik. Vətən çoxdan satılmışdır və Məhəmmədəli olmasaydı, Napaleon gələydi, bir çarə tapa bilməyəcək idi.

İndi heç bir şey qalmayıb, məgər ki, adam olaq və papağımızı qoyub görək kimdir iranlıları yetim qoyanlar?

---

İranı əcnəbilərə satan o kəslərdir ki, biz onlara həmişə rəhmət oxuyuruq. Bir tərəfdən padşahlar məmləkəti xərcləməyə məşğul olublar, bir tərəfdən də «üləmayigiramımız» şəri məsələlərlə bütün ömrümüzü məşğul edib, dünyamızı əlimizdən alıblar və ancaq behiştə daxil olmağa nisyə bilet veriblər. Bunlar da keçə, ya keçməyə, Allahü ələm.

Təmsil üçün götürək Buxara şəhərini. Elə bil ki, bura bir İrandır. Məsələn, əmir həzrətləri bir saatlığa İran padşahı, məsələn, Nəsrəddin, ya Müzəffərəddin şah. Bəli, indi gələk üləmaya:

Əşşeyx əl fazil əlmüfti Molla Əbdürrəzaq şah həzrət cənabi aliləri də olsun Nəcəfüləşrəf müctəhidlərimiz. İndi mən müsəlman qardaşlardan bircə bunu soruşacağam (amma mən ölüm, insafla cavab verin).

Sual:

Nəsrəddinlər, müzəffərəddinlər vətəni yavaş-yavaş torqa qoyanda nə vaxt üləmamız tərəfindən avam camaata işarə olundu ki, «ey yazıqlar, huşyar olun! Vətən əldən gedir?»

Həmçinin Buxara üləması. Müsəlmanlar elə hər yerdə bir cürdür.

---

Mən sözümü qurtarıram. Məşədi qardaşlar mənə güllə yağdırınca yaxşı olardı ki, bir yarım saat mənim xatirim üçün fikrə gedəydilər. Yoxsa Rüstəm pəhləvan kimi qollarını çərməyib düşürlər meydana və qoca Molla Nəsrəddini davaya çağırıb meydan sulayırlar necə ki, «Şahnamə»də yazılıb:

Mənəm pəhləvan, eylərəm nərə mən,
Nə Cavid şair, çərən, ya pərən.
Bu laməzhəbin, Mollanın jurnalı
Vurun, öldürün, ay gədə, Səbzalı!

---

Sağlıq olsa yenə danışarıq.

*Molla Nəsrəddin*

## ARTIQ QAN

On beş min manat çox puldur. Amma bir hesaba baxanda on beş min manat bir şey deyil, çün Aşqabad alınanı otuz ildir, bu vaxtacan hər il lotular biz camaatdan on beş min manat alıblar. Otuz ilin müddətində dörd yüz əlli min manat pul eləyir. Bu pulları saxlasaydıq, indi bizim hər dərdimizə dərman olardı. Amma bir məsəl var




İran (Osmanlıya): Bu əskikliyə dözə bilmərik və nə qədər canımız sağdır, gərək çalışaq ki, sərhəddən bir qədəm qabağa qoymayasınız. Cəmi bədbəxtliyimizə səbəb sizsiniz.







Fransada təhsil almış iranlılar.

Интеллигентный персиянинъ

В Персии.

İranda.

Yevropada.

Въ Европе.




– Mirzə, bunu oxu. Deyirlər bu mürtəd genə dinə sataşıb.

– Bəs siz özünüz niyə oxumursunuz?

– Biz bisavadıq.

deyərlər: «Çıxan qan bədəndə durmaz». Buradan bir haşiyə çıxaq. Uşaq vaxtı usta Həmid rəhmətlik dədəmin başını qırxardı, qırxanda çox da kəsərdi. Bir gün rəhmətlik dedi: «Ay usta, nə çox kəsdin başımı?» Usta Həmid bir ah çəkib başladı: «Kərbəlayı, çıxan qan bədəndə durmaz». Halbuki mən də baxırdım: Ülgücü iti, özü səliqəli olsaydı, biçarənin başını kəsməzdi. Amma mən də bu sözlərə şərikəm: «Çıxan qan bədəndə durmaz». Mətləbdən uzaq düşdük:

Aşqabadda dörd məscid var, yəni mollaların dörd böyükmaqazinləri var. Bu maqazinlərdə hər il məhərrəmlikdə, orucluqda füqəranın cibindən on beş min manat çıxıb düşür lotuların cibinə. Bu mağazinlərin hərəsinin məxsusi bir adı var. Məsələn, qarabağlı, şirvanlı, iranlı, xivəli. Bu maqazinin birini şəkililər açmaq istədilər isə də, bir kəmetiqad məlun bais olub qoymadı. Bəli, hələlikdə qarabağlı maqazini barəsində bir neçə kəlmə söz danışaq. Bu maqazin vaqe olub şəhərin çox gözəl yerində: çox mötəbər tikilibdir, yanında on dükanı, dükanlar ildə altı min manat icarə götürür. Hökumət gördü ki, müsəlmanlar sağ başlarını öz əlləri ilə yaralayırlar, fürsəti qənimət bilib əlimizdən aldı. İndi isə on iki ildir, bu da eləyir 72 min manat, bunun da eybi yoxdur, «çün çıxan qan bədəndə durmaz».

Qafqazda, ya İranda bir lotu qalmayıb ki, gəlib bizim pullarımızı alıb, bizə əvəzində bir «Kürd Şahnaz» oxumamış olsun. Məsələn. Rövzəpəz Hacı Molla Əbdüləli Şirvanlı, Qubalı Hacı Molla Babanın şagirdi bildir aşıq udan kimi min beş yüz manatımızı uddu. Ancaq genə bu il lotular gəlib doldular Hacı Məhəmmədtağı karvansarasına, səslərini açdılar. Bəli, şərbət teştləri daşınır maqazinlərə, hacılar dəyənək hazırlayırlar, kimi xəncərin, kimi başını qırxdırır, kimi baş qırxır. Bəli, Molla Müseyib zikrini əzbərləyir, özü də genə hər ilki kimi baş vuracaq. Heyif ki, Hacı Paşa yoldaşı yoxdu, olsaydı, bir az başını çapan çox olardı. Bəli, kablayılar da gəlib minbərin dibində oturub xalqın qəşəng uşaqlarını yığıb başlarına, onların döşlərini açdırıb sinə vurdururdular və bir qırmızısaqqal kişi başlayır: «Bər Yəzidi-pəlid ibn Ziyad hər dəmu səd həzar müdam lənət baş». Xalq da cavab verəcəklər (beş baş). Onda çayçı Yusif başlayacaq sinəzəni, gimnazistlərimiz hammallara qoşulub duracaqlar zəncir vurmağa, bəzi qoca uşaqbazlarımız da bəhanə ilə cibindən papiros kağızını çıxardıb, tüpürcəkləyib, «Allah əcr versin» deyib gimnazistlərin dalına yapışdıracaqlar. Məşədilər və kərbəlayılar da şirin çayı içib, papiroslarını çəkib, bəzisi xoruldayacaq, bəzisi də mürgüləyəcək. Çay paylayanlar qəşəng uşaqlara iki istəkan verəcəklər. Samavarın üstündə duran özü bilir ki, fürsət vaxtında qənddən, çaydan oğurlayacaq. Onda xəbər gələcək ki, ələm gətirirlər. Bəli, dünbəyi vura-vura, tullana-tullana ələmi gətirəcəklər. Ələm gətirən molla da Heydər lotudur ki, bunu hamı tanıyır.

*İmza: Qırxayaq*

---

## GÜLMƏYİM GƏLİR

Gördükcə gül camalınızı gülməyim gəlir,
Etdikcə fikr halınızı gülməyim gəlir.

Bir tərəfdən qanlar töküb canlar qurban edib, evlər viran edib, maldan, candan keçib məşrutə almağınızı görürəm, məclisi-milli, parlament açmağınızı seyr edirəm, amma vəkil intixab etdiyiniz mollalara baxıram, gülməyim gəlir.

Yevropa tərəqqisin görməgüzü görürəm. Onları yamsılamağın lüzumun bildügüzü bilirəm. Köhnə, cəfəng adətlərdən (adət deyirəm, şəriət demirəm ha!) əl çəkməyi dərk etdigüzü dərk edirəm. Amma pul yığıb parlamentə mərsiyəxan gətirməgüzü fikir edirəm, gülməyim gəlir.

Elə ağır şərtlərlə pul borc alınsa məmləkətin istiqlalı getməyin danmamağıvuzu danmıram, mitinqlər edib daxili borc etməyi qət etdigivüzi bilirəm. Amma vermək məqamına gələndə pullular özlərin şəhid etməyi görəndə, gülməyim gəlir.

Şeytanbazarında Əncüməni-xeyriyyeyi-iraniyana kimlər intixab olmağın bilirəm. Amma Bakıdan gələn qonağın nitqin eşidəndə gülməgim gəlir.

«Molla Nəsrəddin»i oxuyanda hamı ürəyində və məhrəm yoldaşların yanında «əcəb yaxşı yazıb, əcəb doğru yazıb, mərhəba, mərhəba deməklərin bilirəm. Amma avam məclisində, qara məxluq yanında «Molla Nəsrəddin» kafərdir, dinə sataşır» deyib bağırmaqların göröndə gülməyim gəlir.

*Qızdırmalı*

---

## TELEQRAF XƏBƏRLƏRİ

### BUXARA

Burada hamı əsnaf və tacirlər əmiri istiqbal etməyə hazırlanırlar. Xüsusən mütrüb sinfi hamıdan artıq tədarükdədirlər.

### TƏBRİZ

Dəllak cəmiyyəti İran dövlətinə iyirmi milyon manat borc verməyi dəröhdə edirlər. Bu şərtlən ki, Mirzə Hüseyn parlamentə sədr olsun.

### NƏCƏFİ-ƏŞRƏF

Müctəhidlər fitva yazdılar ki, məmləkətin belə axır nəfəsində gərək Məşhəd və sair mövqufat boynuyoğunlardan kəsilib məmləkət ehtiyacına sərf olunsun.

---

ŞEYTANBAZAR

Bir min iki yüz on iki nəfər mömin bəndə Molla Nəsrəddinin kafərlik kağızına möhür basdı.

---

KÜLT

Molla əmi! Ölənlərinizə Allah rəhmət eləsin, mənim rəhmətlik nənəm həmişə bizə nəsihət edərdi ki, bala, Allah xatirinə məhlədə toyuq saxlamayın. Çünki quşların içində bu toyuq firqəsi ən naşükürlərindəndir. Zira bunlara hər gün nə qədər dən töküb hörmət eləsən də bu heyvanlar öz təbiətlərində sabit qalıb, genə fürsət ələ düşdükcə bitəklif evə girib palaz paltarı çipilliyəcəkdir. Hərgah bir də sən üstə çıxıb xahiş eləsən ki bu dəvətsiz müsafiri evdən çıxarasan, dərhal həmin toyuq irəfə çıxıb, qab-qacağı yerə salıb qıracaq, necə ki, həkim Calalın evindəki qab-qacağı zəyəmli Abdulla Nadir oğlu qıran kimi, başlayacaq sənin evində «qaqqaq» deyə rusca danışıb evin bərəkətini qaçırmağa. Və bəzi vaxt irəfdən balaca uşağın başına bir ağır şey salıb, məsum uşağın ölməyinə dəxi səbəb olacaq. Məsələn, necə ki, yarım ay bundan müqəddəm qaxbaşlı Hacı İsmayılın övrəti Məsumə dörd yaşında olan ögey qızını başından maşa ilə vurub öldürən kimi. Bəli, rəhmətlik nənəm arabir bizə belə təsəlli dəxi verərdi, toyuğun yenə hər zərərinə dözmək olar, amma kültün rəftarını Allah düşmənə də göstərməsin. Məsələn, gedib nə zəhmət ilə və baha qiymətə ikisi bir şahıdan 25-30 ədəd yumurta alıb tökürsən kültün altına ki, cücə çıxarsın. Bir də ya görəcəksən, cücələr çıxana yaxın bu bədzat kült yumurtaları sındırıb, cümləsini içibdi, necə ki, möhtərəm ruhanilərimiz mövqufat pullarından pürrəng və pürşəkər çay içən kimi. Yaxud cücələri çıxardıb bir az böyüklədəndən sora bu məlun kült dimdiyi ilə o məzlum cücələrin başını, gözünü yarıb yola salır. Bəzən belə də ittifaq düşür ki, kült bədxasiyyət və bədəxlaq olduğundan cücələr sayuz edib kültü baykot edirlər. Necə ki, Qaxda məhəllə imamı Hacı Əbdürrəhman əfəndini, bədrəftar olduğundan, öz camaatı altı aydır ki, baykot ediblər. Məzkur hacı əfəndi otuz ildir ki, Qaxda yuxarı məsciddə imamdır. Onun öz camaatı ilə olan bu vaxta kimi rəftarının nəticəsi budur ki, bir əsrdən bəri bir-biri ilə nəslən və qan ilə qohum olmuş otuz ev camaatı bir-biri ilə düşmən edib və məscidi qapadıb özü də gedib vəqf evində oturub.

İndi, Molla əmi, mənim fikrimə bir şey gəlir. Necə ki, məlumdur ki, Yevropa aləmində hər kəs 25-30, ya 50 il xidmət eliyəndə onun camaatı onun şərəfinə bir nişangah qayırırlar ki, həmişə o vücudi-möhtərəmin ismi zikr olunsun. Bəlkə bu mənzur ilə imam Hacı Əbdürrəhman əfəndi otuz illik xidmətindən dolayı camaata rəhm edib, onları xərcə salmayıb özü bir pamyatnik qayırmaq istəyir ki, bu nəhv ilə onun adı həmişə yad olunsun. Molla əmi! And verirəm səni axsaq sofi Bilal Mustafayevin miyanə canına, hərgah imam hacı əfəndinin fikri belə isə bu üsuli-cədid pamyatniki Yevropa aləminə məlum etməklə biz müsəlman tayfasının papağını ucaldasuz. Əfv edəsiz çox uzun oldu.

*Sofi zənbil*

---

NƏZM

Ey omide-naomidan, ey pənahe-bikəsan,
Naümidik, rəhm elə, dəste-mən damane-to.
Nobahare-hikməti zan ru ke, dər hər həft ruz
Por konəd bazari ra məcmueye-əlvane-to.
Hasidi gər əz həsəd təkfir edə məcmuəni,
Əkse-u bayəd şəvəd filfour dər divane-to.
Neməte-xase xodayi bər xəlayiq əz xuda,
Lal əz yəzdan şəvəd hər kəs konəd kofrane-to.
Gər yeki molla bequyəd şəne-vey qomgəşte əst,
Şəne-an kəs kəm şəvəd hər kəs nədanə şəne-to.
Hərçe xeyre-mellətəst anra bequ Molla əmu,
Vəqt olar annar səni heç qanmayan İrani-to.
İn həme qoftim və likən baz darim yek soxən,
Minomayəd key qəbul in zolm ra vecdane-to.
Ta niyə qorxaq, dadaş, qoy söyləyək lap aşikar,
Zire-çador ta bəkey zindan keşəd nisvane-to.
Müstəbidlər zülm ediblər dər hüquqi-müslimə,
Gər inanmırsan, soruş əz zadeye-Nemane-to.

*İmza: Xortdan bəy*

---

İKİ YOLDAŞIN SÖHBƏTİ

Şaxsey – Şamaxıda məktəb açılacaq.
Vaxsey – Əgər bavər konəm əqləm nəbaşəd.
Şaxsey – Məktəb açmaqda sünnilər ilə şiələr ortaq olacaqlar.
Vaxsey – İnanan daşa dönsün.
Şaxsey – Məktəb üçün hər kəs bəqədri-qüvvə ianə edəcək.
Vaxsey – Şamaxılılardan başqa.
Şaxsey – Məktəbin binası üçün Dərə məhlədə olan böyük meydan alınacaqdır.
Vaxsey – Bax! Bax! Vurmadığına bax, daşın da böyüyünü götürür!
Şaxsey – Camaat bu işə çox yaxşı gözlə baxır.
Vaxsey – Bəli, bəli, bəli! Dəvə nalbəndə baxan kimi.
Şaxsey – Məktəbdə heyət də oxunacaq.
Vaxsey – Qaranı geyim, kosa Hacı İbrahim də elə deyir.
Şaxsey – İndidən hər kəs öz övladı üçün məktəb forması hazırlayır.
Vaxsey – Mən eşidən, başları qırxıq, belləri qurşaqlı olacaq.

*İki yoldaş*

*Müdir və baş mühərrir: Cəlil Məmmədquluzadə*




Naxçıvanda eşidiblər ki, filankəs can üstədir, gəliblər ki, bəlkə vəfat etmiş
ola götürələr, amma görürlər ki, hələ ölməyib. Bir qədər gözləyirlər ki, bəlkə ölə.

15 rəbiələvvəl 1328 **Beşinci il** 14 марта 1910 г.

# ملا نصر الدين

№11 Qiymәti 12 qəpik. **МОЛЛА НАСРЕДДИНЪ** Цена 12 k. № 11




Vurun, vurun, bu gün Əbdürrəhim Daminov müəllimi istəməyən şagirdlər sabah deyəcəklər ki, «popeçitelləri istəmirik».

ƏDƏBİYYAT

## Əhvalpürsanlıq, yaxud qonuşma

– Nə xəbər var, məşədi?
– Sağlığın.
– Az-çox da genə?
– Qəzet almış Hacı Əhməd də.
– Pa! Oğlan, nəmənə?!Sən özün gördün alanda?
– Belə nəql eylədilər!
– Dəxi kim qaldı, xudaya, bu vilayətdə mənə?!.
Bu isə pəs o ləinin də işi, qullabıdır,
Dinü imanı danıb, yoldan azıbdır, babıdır!

– Dəxi bir başqa xəbər?
– Hac Cəfərin oğlu Vəli!
– Uşqolaya qoyub oğlun.
– O qurumsağ da?
– Bəli!
– Sənə kim nəql elədi bu sözü?
– Bilməm kim idi,
– Eylə isə ona da min kərə lənət, deməli.
Bu isə pəs o ləinin də işi qullabıdır,
Dinü imanı danıb, yoldan azıbdır, babıdır!

– Dəxi bir başqa xəbər yoxmu?
– Tanırsan Qəfəri?
– Nə Qəfər? Hansı Qəfər?
– Mirzə Manafın pədəri.
– Tanıram.
– Dün o da bir şübhəli kəslə danışıb.
– Kim deyirdi?
– Yedici Xansənəm arvadın əri.
– Bu isə pəs o ləinin də işi, qullabıdır
Dinü imanı danıb, yoldan azıbdır, babıdır!

– Genə bir başqa xəbər varmı?
– Bizim qonşu Kərim.
– A... A... A?..
– Bəli, hə, hə!
– O nə qayrıb, de görüm?
– «Molla Nəsrəddin» alıb həm özü, həm oğlu oxur.
– El bütün kafər imiş, ölkədən yoxmuş xəbərim?!.
Bu isə pəs o ləinin də işi, qullabıdır,
Dinü imanı danıb, yoldan azıbdır, babıdır!

– Mənə bir böylə xəbər çatdı: Səməd dam-daşını
Satıb, onversətə göndərmək üçün qardaşını.
– Bu xəbər doğrudur, ancaq bunu da bilməlisiz,
Özü də çəkmə geyib, saç da qoyubdur başına.
– Bu isə pəs o ləinin də işi, qullabıdır,
Dinü imanı danıb, yoldan azıbdır, babıdır!

Bir belə söz də deyirlər ki, sizin Kəblə Aşır
Yeni məktəbçilər ilə gecə-gündüz yanaşır?
– Bəli, düzdür bu dəxi.
– Heyf o dövlət də ona,
Dövlət azdırdı onu, dini-xudadan uzaşır,
Bu isə pəs o ləinin də işi, qullabıdır,
Dinü imanı danıb, yoldan azıbdır, babıdır!

– Doğrudurmu ki, Bədəl də qoyub ağzın yabana
Danışır bir para sözlər ki, dəyir rövzəxana?
– Bəli, qurbanın olum, lap o çıxıb məzhəbdən!
– Görməyirsənmi şişib boynu, dönüb bir qabana?!
Bu isə pəs o ləinin də işi qullabıdır,
Dinü imanı danıb, yoldan azıbdır, babıdır!

– O qurumsaq Cəbi də gözləməyir hörmətimi,
Burda, orda, belə derlər ki, edir qeybətimi.
– Bəli, hətta bu işin üstə onun arvadına
söymüşəm.
– Borcun odur, gözləmisən qeyrətimi.
Mən də həm daim ona yağdıraram lənətimi,
Başlayıb dəvətimi,
Ərz edib hacətimi.



Vəqfi-nifrin edərəm
Günümü, saətimi.
Deyərəm xalqa: bu bidinin işi qullabıdır,
Siz də lənət oxuyun, çünki bu məlun babıdır!..

*İmza: ........*

---

## NOVRUZ

Ax, gözəl bayram, ax, gözəl Novruz! Ax, min-min balaca uşaqların qəlblərini şad edən Novruz.

Vəqti-bəharəst xiz, ta betamaşa rəvim. Dur gedək tamaşaya, bax gör nə gözəl bayramdır: qəzetələr yarpaq kimi göyəriblər. Tiflisdə Şeytanbazar müsəlmanları baydaqların ucuna alma və portaxal taxıb və özləri də tumanlarını çirməyib düşüblər küçələrə və Təbriz dilənçiləri təki ağaların qapılarına gedib mübarəkbadlıq edirlər. Amma bunu unudurlar ki, bura Tiflisdir, belə şeylər Təbrizdə olar; orada belə hərəkətlər insanı utandırmaz, amma Tiflisdə adam xəcalət çəkər.

Həmə ruzi-ma bəxti-firuz bad.

Allah cəmi müsəlman qardaşların bayramını mübarək eləsin, xüsusən xudayi-taala Mirzə Əli ağanın vücudunu bibəla eləsin ki, Bakıda «İttihad» mədrəsəsinin şagirdlərinin döşünə medalları düzüb, ötürüb Bakının küçələrinə. Bakı «cahil»ləri görəndə «oxqay» deyirlər, amma əcnəbi millətlər də görüb ürəklərində deyirlər «nesçastnıy narod» (hərçənd ki, əcnəbilər anlamırlar).

***

Ax, gözəl bayram! Qəlbləri şad edən bayram. İran aclarını tox edən bayram! Sən olmasaydın dövlətli İran tacirləri və dövlətli İran xanları bayram günləri bu qədər pul yığıb İran aclarına göndərməyəcək idilər. Girəm ki, yaxşı elədilər yığmadılar. Allah atalarına rəhmət eləsin; əgər yığsaydılar, İran aclarından qabaq pulların hamısını özləri yeyəcəkdilər.

Allah cəmi müsəlman qardaşlarının bayramını mübarək eləsin! Allah Əncümən üzvü Məşədi Abbası Bakı iranlılarına çox görməsin.

Vallah, mən ki, utanıram!..

*Molla Nəsrəddin*

---

## OXŞAYIR

İki şəhərdir ki, bir-birinə çox oxşayır: Biri Orenburq vilayətində Qarğalı şəhəridir ki, orada camaat şəhər rəisi seçəndə elə bir adamı seçirlər ki, qanacağı, elmi və savadı olmasın və səbəb də bunu qoyurlar ki, əgər elmi olsa, başlar şəhəri Yevropa sayağında abad eləməyə və abad eləyəndə də, söz yox, şəhər əhlinə çox zərər və xərc vuracaq və bu xərclər də, söz yox ki, şəhər əhlinin cibindən çıxacaq.

Qafqazda da bir belə şəhər var, adını deməném, hər kəs istəyir özü tapsın görüm bu hansı şəhərdir?

*Hərdəmxəyal*

**ELAN**

On yaşından on beş yaşınadək çayçı şagirdi, nə qədər olsa, qəbul edə bilərik.
Xahiş edənlər bu adres ilə soruşsunlar:
Qutqaşendə çayçı dükanları

## KEÇƏCƏYƏ TƏƏSSÜF, GƏLƏCƏYƏ BİR FİKİR

**(Tiflisdə bir seyidin öz yoldaşı bir molla ilə söhbəti)**

Doğrudan doğrusu, seyidlərin, mollaların biryolluq ehtiramı getdi. Allah rəhmət eləsin atalara, yaxşı deyiblər: «Keçən günə gün çatmaz». Doğrudan da ki, çatmaz!

Allah ölənlərinizə rəhmət eləsin, rəhmətlik atam nağıl eləyirdi ki, camaat o qədər seyidlərə inanmışdılar ki, neçə dəfə gecə yarısında şirin yuxudan oyadıb naziri əllərində tutub ağlaya-ağlaya verirdilər, nədi, oğlum qızdırmalıdı, arvadım çətin doğur.

Rəhmətlik and içirdi ki, qırx yaşa yetişmişəm əlimi ağdan qaraya vurmamışam. Həmişə elə cəddimin bərəkətindən qapıma gətiriblər, yemişəm. Deyirəm: a rəhmətlik, bir gözünü aç gör indi nə aləmdi. Haman seyidlər gör necə gözdən düşüblər. Bunların hamısına da səbəb, bax, elə bu Molla Nəsrəddindir!!!

A kişi, sənin başına and olsun, hər il məhərrəmdə lap əskiyi genə beş yüz manat dəxlim olardı. Amma bu il laməzhəbin bərəkətindən ancaq iki yüz manat oldu. Bir neçə gün bundan irəli istədim ki, bir kağız möhürlədib bu «Molla Nəsrəddin»i bağladım. İndi ki, əlhəmdülillah, özüm də Əncümənda üzv olmuşam, bundan sora ola bilər ki, bir iş görüb bu jurnalı bağladam.

Bax, bunu da deyirəm ki, deməyəsən seyid özündən ötrü çalışır. Yox özün bilirsən ki, mən məəttəl qalan deyiləm. Bax seyidlik olmasın, mərsiyəxanlıq edərəm; o olmasa, qumarbazlardan yaxşı dəstixoş da ala bilərəm; o olmasa, qənnadı şagirdliyi də eliyə bilərəm. Bunların hamısından əlim üzüləndən sora axırı hamamda da işləyə bilərəm. Bunlardan savayı o qədər sənətlərim var ki, pir mənim yanımda heç zad ola bilməz. Ancaq mən sizdən və bir para mollalardan ötrü ağlayıram ki, sabah siz acınızdan öləcəksiniz. Nə isə, hərə özü ilə olur-olsun, əvvəl-axır ki, bu «Molla Nəsrəddin»i bağlatmasaq bizim fırıldağımız işləməz, indi qeyrətiniz var, buyurun! Yoxdusa ki, heç.

*İmza: Başsız bədəndən bir əza*

---

Fevralın 22-də İrəvanda.



Müsəlmanlar da deyirlər ki, «bir surətdə ki, mütəvəlli Mirzə Hüseyni kənar elədilər, məscid hamamında qüsl batil olacaq». Şəhərin cəmi möminləri hamamın qapısına yığışıb müctəhidlərə teleqraf ilə şikayət göndəriblər.



Ermənilər katalikosun İrəvana gəlməyi münasibəti ilə mitinq eləyirlər.



Günlərin bir günü Molla Nəsrəddinin yolu düşdü
Vladiqafqaz meşələrinə... (mabədi var)




Не доволенъ ролью.

– Məgər insafdırmı ki, bu balacalıqda rolu mənə verirsiniz.
Mən tanışlarıma nə cavab verim?..

## QOYMURLAR

Heç yadımdan çıxmaz: Uşaqlıqda kişilər ilə dağlara gəzməyə gedərdim. Yoxuş çıxanda kişilərin dalına düşüb onların izi ilə dırmaşardım. Balaca yoldaşlarımdan bəziləri özbaşına kimi istədiyi yerdən çıxırdılar, ayaqları sürüşürdü, dərə aşağı yumarlanırdılar, kişilər də onlar məzəmmət edirdilər, deyirdilər ki, sən də bunun kimi bizim dalımızca, bizim izimizcə gəl ki, yıxılmayasan.

İndi də böyüyüb kişi olmuşam, həmişə fikrim ucalıqdır. Özümü dərənin dibində, özgələri dağın başında görürəm. Mən də yuxarı dırmaşmaq istəyirəm. Yanımdakı yoldaşlardan biri qolumdan tutur, dördü qılçamdan geri çəkir, dağın başındakılar da üstümə daş dumarlayırlar. Xülasə, işim çox çətin olubdur, əgər belə gedirsə, vay halıma, yanımdakılar qoysa, genə bir növ çıxaram.

Münasib ikən bir neçə kəlmə də yazım. Elmin, fənnin tərəqqisindən danışıram, deyirlər sarsaqlayıb. Yevropeyski dolanıram, deyirlər gədə lap xarab olub. Qızımı oxuduram, deyirlər dindən çıxıb. Odur ki, qoymurlar. Nə yuxarıdakılar qoyur, nə aşağıdakılar. Hər kəs bu mətləbi oxusa deyəcək: dəngəsər oğlu dəngəsər lap dəngəsərləyib.

*Dəngəsər*

---

## ELAN

Mən eşidirəm ki, Tehranda sünnilər ilə şiələrin arası bir az soyuyan kimidir. Hətta qorxusu var ki, müsəlman qardaşlar məşğuliyyət üçün bir az «qətl» şəbihi gətirələr. Bununla xəbər verirəm ki, müsəlmanların ittihadı yolunda gözəl vəzlər edirəm və sözüm elə təsir bağışlayır ki, mənim məclisimdən çıxandan sora bir sünni ilə bir şiə küçədə rast gələndə biri-birini vurub öldürmək istəyir.

Müsəlman qardaşlara xidmət etməyim lazım olsa, yazıb bu adres ilə soruşsunlar: şamaxıda Şeyx Həbib.

## TELEQRAF

Orenburq: Buxaralı kişmiş satan Aman bəy Atabəyov 23 yanvarda Əmiri-Buxara həzrətlərinə 14 yaşında bir fərbəsərin lağərmiyan beçə təqdim etdi.

## ELAN

İstambulda çıxan «Siratül-müstəqim» jurnalının abunə dəftəri açıqdır. Jurnalın məsləki budur ki, hər bir yanda azadə qələm sahiblərini tutub qətlinə fitva verdirsin. Necə ki, 28-ci nömrəsində məşhur doktor Abdullah Cövdəti kafir adlandırıbdır. Mirmehdi ağanın müridləri həmin məcmuəyə abunə olmaq istəsələr, yazıb İstambuldan gətirtsinlər.

## TEATR

– A bəy, niyə sən heç teatra gəlmirsən?

Cavab: – A kişi, sən Allah, boş-boş danışma. Teatra oğul-uşaq gedər, mənim kimi yekə kişiyə də yaraşarmı teatra getmək?

---

## HƏMİD PAŞA

«Novoye vremya» qəzetəsi müsəlmanlara nə nəzər ilə baxır – hamıya məlumdur. Bu qəzetəni oxuyanlar bilirlər ki, bir nömrə olmur ki, müsəlmanların pisliyinə dair bu qəzetdə bir məqalə olmasın. Həmin qəzetənin axırıncı nömrəsində Şamaxıdan bir məktub var. Məktubun başında böyük hərflər ilə yazılıb «Həmid paşa» və həmin məktubda yazılan məqalənin məzmunu təxminən budur ki, guya burada bir şeyx var, adı Həmid paşadır. Bu şeyxin hünəri heç bir şeydə deyil, məgər ki, lotuluqda bunun misli özgə şəhərlərdə yoxdur. Həmid paşa guya bir dövlətmənd adamdır və bu dövləti də gözləri kor camaatın cibindən iki min hiylə ilə çıxardıbdır. Özü də bu saat Şamaxıda bir böyük imarət tikdirir, amma bir qəpik xərc qoymur. Çünki avam camaat bimüzd işləyir və bunların hamısından sora Həmid paşanın peşəsi uzanıb gözəl övrətlərə ayaqlarını ovuşdurmaqdır. Məktubun sahibi bu böhtanları yazandan sora məktubun axırında deyir ki, hərçənd Şamaxının qeyri üləması zahirən bir növ abırlıdırlar, amma bunların çoxu batində camaatın düşmənidirlər. Məsələn, buranın ən nüfuzlu mollası Mir Mixdi ağa **(Mir Mehdi ağa)** hər dəfə moizəsində günün eyiblərini axtara-axtara bircə dəfə də Həmid paşanın lotuluqlarından işarə ilə bir söz danışmaz. Səbəbi budur ki, onun sirlərini açsa, o da bunun fəndlərini üzə çıxardar. Məktubu yazanın imzası «Şəmaxines»dir – **«Шемахинецъ»**.

Rus qəzetlərinin möhtərəm üləmamıza sataşmağı tamam islam aləminə sataşmaqdır. Ümidvarıq ki, qeyrətli qəzetələrimiz tərəfindən məlun «Şemaxines»ə layiqincə etiraz və izhari-nifrət yazılar.

---

## QAFQAZ DARÜLFÜNUNU

Tiflisdə və Bakıda çıxan rus qəzetələrində indi bu saat çox danışıq olur ki, «aya Qafqaz darülfünunu harada

açılsın? Tiflisdəmi, ya Bakıda». Hərə bir söz deyir. Tiflisdə açılmaq tərəfdarları belə dəlil gətirirlər ki, Tiflis şəhəri Qafqazın mərkəzidir, buranın abü havası Bakıdan yaxşıdır və burada təhsil tapan tələbələr küçədə getdikləri vaxt Bakı qəssablarından «ax, nə maldı!» sözlərini eşitməzlər.

Darülfünunun Bakıda bina olmağını tələb edənlər də bunu deyirlər ki, Bakıda pul çoxdur və zəmanəmizin qaydasına görə kasıb dövlətliyə gərək tabe ola.

Əgər Molla Nəsrəddindən soruşsalar, biz darülfünunun Bakıda açılacağına rəy verərik. Səbəbi budur ki, Bakının havası doğrudur ki, bir az pisdir, amma suyunda bir xasiyyət var ki, burada oxuyan uşaqlara şairlik təbi verir. Bunu bilmək lazımdır ki, Qafqazda məşhur şairlərimiz Bakı şəhərindən çıxıblar. Məsələn, götürək Bakının qız məktəbini. Qəzetələrin bir nömrəsi olmur ki, orada şairlərimizin əsəri olmamış olsun. Dağıstanlı Aişə və Fatimənin, Sona Axundovanın və Hüseyn Cavidin kəlamı bir möcüzdür ki, bunu ancaq Bakı şəhərində görmək olar. Bunlar hamısı Bakının suyundan törəyən təbii istedaddır ki, nəinki Tiflisdə, bəlkə Firdovsinin vətənində belə şeylər ola bilməz.

«Olmaram razı, əgər cəhldə qalsa vətənim,
Vətənim qalsa əgər cəhldə, yansın bu tənim».

İndi mən səni inandırıram ki, sənin vətənin hələ yüz il də bundan sora cəhlin lap dibində qalacaq. Hər nə bilirsən, elə. Məndən əgər məsləhət soruşsan, «tənini» yandırma. Doğrudur keçənlərdə Məryəm xanım o qədər sizin «təninizi» üşüdüb ki, indi də ondan qorxursan. Amma yaxşısı budur ki, başını salasan aşağa və elm oxumağa məşğul olasan ki, gələcəkdə lazım ola.

Yoxsa sizsiz də qəzetələrimiz şerlə doludur.

Bayramınız da mübarək olsun.

*Lağlağı*

---

## HÜSEYNLƏR

– Hansı Hüseyni deyirsən, irəvanlı Mirzə Hüseyni?

– Xeyr, onu demirəm.

***

Yoxsa Təbrizdə Əncümən üzvü vaiz Mirzə Hüseyni deyirsən?

– Xeyr, onu demirəm.

***

– Yoxsa Səbzvarda ağayi Şirazinin naibi Axund Hacı Mirzə Hüseyni deyirsən ki, məşrutənin əvvəlinci düşmənidir və bir quzudan ötrü yeddi dəfə hökmünü dəyişir.

– Xeyr, onu da demirəm.

---

– Hə, indi bildim hansı Hüseyni deyirsən: Vladiqafqaz konsulunun naibi Hüseyn xanı deyirsən.

– Bəli, bəli, həmin Hüseyni deyirəm ki, indi Dərbənddə əyləşir. Dad onun əlindən.

*Həmşəri*

---

**ELAN**

Təzə üsul ilə açılan dəllək dükanı

Təzə üsul ilə İranın başını qırxmaq istəyənlərə dərs verirəm. Belə ki, bir az müddətdə böyük dövlətə çatsın. Necə ki, mən özüm altı ay müddətində Gilanda gömrük işlərini idarə eləyib axırda otuz səkkiz min manatı qoydum cibimə və qaçdım Bakıya. İndi İran məni tapsın görək haradan tapacaq.

Məni görmək xahiş edənlər Bakı mehmanxanalarından soruşsunlar.

## VƏZİRİ-XARİCƏ

Tehran Məclisi-millisi hökm edir ki, vəziri-xaricə məclisdə hazır olsun.

Bəli, vəzir təşrif gətirir. Xub, ağaların fərmayişi? Məclis tərəfindən vəzirdən sual olunur:

– Cənab vəzir, İranın daxilində nə qədər rus qoşunu var?

Vəzirin cavabı:

– Ağalara ərz olsun ki, keçən vaxtlarda, doğrudur, İranda rus əsgəri çox idi, amma mən təyin olunandan hökm elədim ki, ruslar qəmişlərini bənd eləməsinlər və mənim qorxumdan rus qoşunları çıxıb getdi. Ancaq beş-on piyan saldat Təbrizdə, beş-onu da Qəzvindədir.

– Xub, pəs yaxşı olar ki, bu beş-on nəfər də başdan olalar.

– Bəli, bəli, bəçeşm, bu gün rus səfirinə yazaram ki, qalanlar da çıxıb getsinlər.

İmza: «Molla Nəsrəddin»in müxbiri.

*Müdir və baş mühərrir: Cəlil Məmmədquluzadə*

Möhtərəm oxucularımıza məlum edirik ki, Novruz və Mövludi-peyğəmbər bayramlarında əmələlərimiz işləmədiyindən məcmuəmizin çıxmağı bir həftə yubandı.

---




Xivədə bayram tədarüki (Novi Urgenc şəhrində)

Doğrudan ki, müsəlman aləminə oxşayır.

Литог. С.Быхова

22 rəbiələvvəl 1328 | Beşimci il | 21 marta 1910

ملا نصر الدين

№12 Qiymәti 12 qәpik. | МОЛЛА НАСРЕДДИНЪ | Цена 12 k. № 12

Buxara acları




Buxara əmiri Peterburq şəhərində bu yavuqlarda fahişələrə bir neçə meşok nişan paylayıb.

Litoq. S.Bıxova

## KEÇİ

«Xah beca, xah bica, xah emruz, xah fərda, hər nöqteyi-Asiya ki əmniyyəti-mali və cani nist, məhali-əql əst ki, beydəqi-Firəngistan bər on nöqtə nəsb nəşəvəd».

Mirzə Mülküm xan «Üsuli-təməddün».

Elm təhsil eləmiş, Osmanlıdan gəlmiş bir cavan, təcrübəli müəllim, məşhur ədib və sahibqələm, abırlı və qeyrətli bir vətənpərəst ki, adı olsun Əhməd Kamal, Bakının Balaxanasında başını salıb aşağa, uşaqlara dərs deyir. Dəxi nə istəyirsən? Camaat razı, şagirdlər razı, məktəb sahibi razı, Allah razı.

«Pəh, pəh! Elə bu? Maşallah, maşallah! Hələ utanmır tərif də eləyir. Nə bilim «sahibqələm, vətənpərəst!» Zəhrimar olsun onun qələmi, cəhənnəm olsun onun «pərəsti». Bunlar mənim qulağıma girməz. Mənə əməl lazımdır. Əməl, əməl!

Bir müəllim ki, nə libası ilə, nə ibadəti ilə öz müsəlmançılığını büruzə vermir, dəxi bizə belə müəllim lazım deyil. Dua eləsin ki, bura Rusiya dövlətidir. İran olsaydı, onun öhdəsindən yaxşı gələrdik».

Budur, iranlıların Əhməd Kamaldan şikayəti və doğrudan da, xudanəkərdə, bura, məsələn, İsfahan olsaydı, Əhməd Kamala kağız yazan iranlılar dinməz-söyləməz onu küçədə tutub ya daşqalaq eləyəcək idilər, ya aparacaq idilər hakimi-şərin yanına. O da fitva verəcək ki, laməzhəbin gözlərini çıxartsınlar.

---

Amma Allah rast salıb ki, İranda hər dərdə dərman tapılır. Əgər İsfahanda birisi kor ola və gedə orada məşhur «Səqqaxaneyi-bozi» ziyarət edə, haman saat gözləri açılar. Bu haman səqqaxanadır ki, neçə il bundan əqdəm qoyun sürüsündən bir keçi ayrılıq gəlib bu səqqaxanaya. Mücavir keçini tutub, camaata xəbər verib ki, bu keçi müqəddəsdir və bəstə oturub. Xalq tökülüb gəlib keçini o qədər öpüb və «noğul» yedirib ki, bir-iki gündən sora keçi mərhum oldu. Amma buynuzlarnı gümüşə tutub asdılar səqqaxanadan. Hər ziyarətə gələn səcdə eləyir.

Əgər bir kəs İsfahanda cürət edib deyə ki, «mənim bu ziyarətgaha etiqadım yoxdur» onun atasını yandırarlar.

Budur, əzizim, bizim işlərimiz!

Biz eşidəndə ki, ingilis hökuməti istəyir İsfahanı sahibləndirsin, təəc-



cüb edirik və rəncidə oluruq və küsürük və deyinirik və yalandan qüssə edirik və doğrudan atılıb düşürük.

Amma heç ayna qabağında durub İsfahan papaqlarımıza baxmırıq. Baxanda da gülmürük, güləndə də ağlamırıq. Ağlayanda o qədər ağlayırıq ki, məhərrəmdən başlamış Bakının «İttihad» mədrəsəsində Novruz bayramına kimi ağlayırıq.

**O qədər ağlayırıq ki, bəsirət gözlərimiz tutulur.** Bir salavat göndər, bir əhvalat da nağıl edim.

*(Mabədi var.)*

*Molla Nəsrəddin*

---

## QOCALDIM

Qocaldım, gedibdir zəmani-şəbabım,
Alınmaz sualım, verilməz cavabım.

Qocalmazdı könlüm, qocaltdı zəmanə,
Əyilməzdi qəddim, dönübdür kəmanə.
Ağarmağı muyin olurmuş bəhanə,
Yaxan yox hənanı, edən yox xəzabım,
Alınmaz sualım, verilməz cavabım.

Nə munis, nə həmdəm, qapımdan girən yox,
Qocalmış bu arvad, məni dindirən yox.
Nə mütə, nə siğə, bir evləndirən yox,
Çoxalmış günahım, azalmış savabım,
Alınmaz sualım, verilməz cavabım.

Mənabirdə molla edir bu xitabı,
Yazılmış hədisə ki, çoxdur savabı.
Edən mütə görməz cəhənnəm əzabı,
Qiyamətdə olmaz hesabım, kitabım,
Alınmaz sualım, verilməz cavabım.
Budur fikrim indi, alım bircə övrət,
Köhənsali-pirəm edim eyşü-işrət.
Bu aləmdə ləzzət, o aləmdə cənnət,
Bu həqqü hesabım, o karü səvabım,
Gərəkdir şitabım, nədir ictinabım.

*Kefsiz*

---

Möhtərəm oxucularımıza məlum edirik ki, biz özümüz gəncəli deyilik və idarəmizin yazıçılarından gəncəli yoxdur, bu keyfiyyəti ki, aşağıda Lağlağı nağıl edir, bunu bizə dörd nəfər Gəncənin millətpərəst və qeyrətli şəxslərindən yazıb göndəriblər ki, biz jurnalımızda dərc edək, ta ki, Vladiqafqazda əyləşən gəncəli Molla İsmayıl Həsənzadənin Gəncə camaatına on il bundan qabaq yetişən xəyanəti oxucularımıza məlum olsun.

***

Əgər Axund Molla İsmayıl ona isnad verilən əməli inkar etsə, o vaxt axund özü bilsin və bütün Gəncə camaatı bilsin ki, bu işə şahiddir.

*İdarədən*

## ƏMALİ-MAHİ-RAMAZAN

1900-cü ilin ramazan ayının üçüncü günü Gəncədə axşama iki saat qalmış getdim məscidə. Axund Molla İsmayıl Həsənzadə minbərin üstündə oturub belə moizə buyurdu:

«Dər bəyani-əmali-mahi-mübarək. Bəli, hər ke, dər şəbi-seyyümi-mahi-rəməzan qüsl künəd dər nəhricari və sikəf ab bər sər berizəd, ta mahi-rəməzane-ayənde filan və filan...»*

Camaat axundun sözlərini eşidib bərk yuxuya getmişdi. Doğrusu, mən bir az başa düşmədim. Çünki avam adamam, savadım-zadım yoxdur və çox istərəm ki, axund fərmayiş etdiyi sözləri başa düşüm. Bəs nə eləyim?

Xülasə, qaldım məəttəl.

---

Bir qədər dayandım, gördüm ki, Axund Molla İsmayıl məsciddən çıxıb gedib evinə. Öz-özümə belə fikir elədim: «Vallah nə qədər ağanın dərin mənalı moizəsinə qulaq assam, bir şey qanmayacağam. Yaxşısı budur ki, xəlvətcə ağanın dalınca gedim, gizlincə girim ağanın həyətinə, bəlkə bir qaranlıq bucaqdan mısıb qulaq verəm və baxıb görəm ki, ramazanın gecəsini axund özü necə keçirdir və nə tövr ibadət edir ki, mənə də dərs olsun».

Elə necə ki, xəyalımda qoymuşdum, elə də oldu. Ağanın dalınca yavaşca küçə qapısından girib özümü verdim armud ağacının dalına. Ağa girdi otağa, on-on beş dəqiqədən sora əzan deyildi.

---

«Bismillahir-rəhmanir-rəhim, hər ke, dər vəqti-iftar in dua ra bexanəd, xuda əta künəd be u savabe-hər kəsira ki, dərin ruz ruzə daştə əst...»**

Axund Molla İsmayıl duanı oxudu ki, cəmi oruc tutanların savabını alıb ona versinlər.

Müxtəsər, bir-iki saat keçdi. Amma hava soyuq idi, bərk üşüyürdüm. Bir qədər də keçəndən sora gördüm ki, Axund Molla İsmayıl əbasını örtüb çıxır küçəyə. Mən də

---

*«Mübarək ayın əməlləri barədə. Bəli, hər kim ramazan ayının üçüncü gecəsi axar çayda qüsl edib başına otuz ovuc su töksə gələn ramazan ayına qədər filan və filan...» *(Red.–T.K.)*

** «Bismillahir-rəhmanir-rəhim. Hər kim iftar vaxtı bu duanı oxusa, Allah bu gün oruc tutan hər kəsin savabını ona əta edər». *(Red.–T.K.)*




– A bəy izin veriniz, sizi də cəmiyyəti-xeyriyyəyə üzv seçək.
– Разрешите и Васъ избрать члены правления благотворитъ. Общества....
– Xeyr, məni bağışlayınız, mən çinovnikəm, cəmiyyətinizə də üzv olmaq mənə yaraşmaz.
– Простите я не могу, ибо я чиновникъ.




Məktəbin bağlanmağına balaca uşaqlar həmişə sevinirlər.
Закрытие школы – праздникъ маленькихъ детей. Астрахань.






**Rotter** **Hökumət müfəttişi**

– Müəllim (müfəttişə): Ruhani məktəblərimizi təftiş etməyə haqqınız yoxdur. ........................................................................

onun dalınca çıxdım ki, ramazan gecəsinin əməlını təkmil öyrənim. Axund gedir, mən gedirəm. Bir böyük imarətin qapısına yetişib axund girdi içəri. Mən də istədim girəm, qapıda duran xidmətçilər qoymadı. Məlum oldu ki, bura qubernator Lotsayevin evi imiş.

Qulluqçuların hərəsinə on dörd şahı üç qəpik rüşvət verdim, soxuldum həyətə və akoşkadan gördüm ki, Axund Molla İsmayıl Həsənzadə həzrətləri qubernatorun otağında əyləşib çay içir və qubernatora bu sözləri deyir:

– Qubernat sağ olsun, mənim nə qədər ki, canım sağdır, hökumətə ixlas ilə qulluq edəcəyəm və əvvələn, bunu lazım bilirəm cənab qubernatora ərz edim ki, bizim Gəncə müsəlmanları dövlətimiz əleyhinə bir para pis fikirdədirlər və hətta çoxluca pul yığıb Osmanlıya, Nəcəfə və Əfqanıstana göndəriblər və Məhəmməd əfəndinin təhti-idarəsində olan «Məktəbi-xeyriyyəni» də o qəsdlə açıblar ki, gələcəkdə öz bəd fikirlərini layiqincə əmələ gətirə bilsinlər.

---

A başınıza dönüm, mən bir qəribə adamam, özüm də qorxaq. Qubernat bu sözləri eşitcək xidmətçilərindən birini çağırıb bilmirəm, nə dedisə, bir də gördüm ki, deyəsən dünyavü aləm bir-birinə dəydi.

Sora məlum oldu ki, haman gecə qəflətən qoşun tökülüb məscidi əhatə edib, cəmi tələbələri heyvan kimi doldurub odun anbarına və məscidi axtarandan sora nə ki, Quran-kitab var idi meşoklara doldurub, saldatlar aldılar dallarına və götürüb apardılar. İyirmi dörd evin övrət-uşaqları bisahib qaldı və neçə-neçə övrət-uşaq qorxudan tələf oldu. Sabahısı günü «Məktəbi-xeyriyyəni» də hökumət bağladı. Əgər bu məktəb, xudanəkərdə, yaşasaydı, indiyədək oradan beş yüz müəllim çıxmışdı.

---

Gəncədə məscid axtarılandan sora və «Məktəbi-xeyriyyə» bağlanandan sora camaatın qorxusundan Hacı Molla İsmayıl dəxi Gəncədə baş saxlaya bilmədi, çünki bir tərəfdən yoldaşı Atakişi baş götürüb qaçdı, bir tərəfdən də qaynatası Hacı Seyid Bağır Xorasanda idi, buna da əli çatmadı. Odur ki, Axund Molla İsmayıl – danosçuların padşahı – əlacsız qalıb günlərin bir günü xəlvətcə Gəncədən baş götürüb qaçır Vladiqafqaza.

---

İndi mən də müsəlman qardaşları and verirəm Baği-şimal müctəhidi Hacı Molla Bərat axundun «Həblülmətin» müdiri Müəyyüdil-islam barəsində olan əqidəsinə ki, mənim bu sualıma Orenburqda çıxan «Din və məişə» jurnalında cavab versinlər ki, aya, yer üzündə bir tayfa tapıla bilərmi ki, Molla İsmayıl Həsənzadə kimi din və millət xainini öz içinə qəbul eləyib, öz əli ilə başını aç tutsun bu dəlləyin qabağına və desin: «qırx başımı»?

---

Bəradərim, düz yol birdir: əgər haqqı axtarırs götür yaz gəncəlilərdən xəbər al, gör düzdürmü biz y dıqlarımız, ya yalandır. Əgər doğru olsa, bizə iman gə əgər yalan olsa, dəxi niyə ürəyini sıxırsan: Bizi ki, ka qələminə verirsiniz.

Biçarə iranlı əxəvilərimiz! Bu behişt əhlləri bir tapa bilmirlər ki, orada kafirə rast gəlməsinlər; Əhm Kamal da hələ bu tərəfdən çıxdı.

Yazıqlar.

*Lağlağı*

---

## RƏNGARƏNG BALIQ

Bir neçə gün bundan qabaq «Molla Nəsrədd məcmuəsinin 7-ci nömrəsində yazılan nəcasat barəsi Şuşa şəhərinin qazisi öz həmməsləkləri ilə bah məscidin hovuzunda saxlanan rəngarəng balıqlardan neçəsini satıb, ətə verib, mövqufat pulu ilə alınan m qalda bişirib, kabab hazır olandan sora «Molla Nəsr din»i tənqid etməyə başladılar, çox adamlara izhari-ni yazdırmağa səy etdilər, amma rəngarəng balıqların t rindən camaat da rəngarəng oldu. Hərə bir söz dedi baykot məsələsi baş tutmadı.

*İmza: Məscid oğrusu*

---

## XAN

Möhtərəm əfəndim! Salamını təbliğdən sora x mətinizə ərz edirəm ki, bəndənizə göndərdiyiniz jurna ünvanında bəndəni xan xitab edirsiniz, lakin bəndə hə xanlıq mərtəbəsinə çatmamışam. Xan üç qism olur: vəlinci – nəsli, ikinci pul verib almaq ilə, üçüncü cav lıqda həzrət əqdəs vəliəhdin hüzuruna müşərrəf oln ilə. Mən isə nə nəslən xanam, nə pulum olub verim olam, nə də cavanlıqda Məhəmmədəli Mirzə xidmət yetişmişəm.

*İmza: Binəsib*

---

## LAMBARD

Şənbə günü martın altısında Tiflisdə şəhər Du sının qabağından keçib düşürdüm Armyanski bazara, düm yandan səs gəlir: hiss, hiss, müsyö Qızdırmalı, m yö Qızdırmalı! Dönüb baxıb gördüm mənim erməni r qəm durub lambardın qabağında məni çağırır. Mən nüb gəldim bunun yanına, əl verdim. Əlimdən tutub məz-söyləməz məni çəkdi lambarda.

Ay oğlan, içəri girdim nə gördüm? Mən deyim yüz, sən deyinən yox, iki yüz müsəlman övrətləri dolub lambarda. Hərəsinin əlində bir bükülü kağız, içi dolu qızıl şeylərinən.

Stolun dalından dəftərçi çağırır: Fatma Qadji Ali qızı. Övrətlərdən biri səsləndi ki, burdadır. Dəftərçi: iki cüt sırğa və dörd üzük ki, qoyub, iyirmi manat iki ay vədəyə aparmışdın, vədə tamamdır, gərək verəsiz.

Övrət: Bəli, ağa, məhərrəmdə apardığım puldur. İndi də bir gərdənbənd, bir cüt qolbağı gətirmişəm, iki ay vədəyə, genə otuz manat istəyirəm. Əvvəlkindən ötrü də genə bu puldan tənzil götürün, genə onu da iki ay vədəyə yazın.

Dəftərçi: Tükəzban Məşədi Qasan qızı! Genə bir övrət (yanında da bir uşağı): Burdadır. Dəftərçi: Qızıl saatı qoyub apardığı on beş manatın iki ayı tamamdır.

Övrət: Hə, məhərrəm təziyəsi üçün apardığım puldur. Ala, indi də bu saat zəncirin, bir də bu sırğaları, on beş manat da verin. Əvvəlkinə də genə iki ay vədə yazın, tənzilin də bu puldan çıxın.

Balaca qız: ana vermə, verme! Mənim sırğamı vermə, bəs bayramda nə taxacağam?

Övrət: Dinmə, başuva dönüm, bəs şirni almıyacağıq? Axı qonum-qonşu, tanıyan, tanımayan bayram günü dəstə-dəstə gəlib dolacaqlar evə. Gərək ortalıqda şirni ola. Sora Allah yetirər, genə pulun verib çıxardarıq.

Erməni rəfiqəm: Müsyö, gördün?

Mən: Gördüm! Çox əcəb, bəs sizin övrətlər sabraniyədə və öz gecə klublarında lato oynamaqdan ötrü şeylərin gətirib girov qoyanda niyə gəlib tamaşa eləmirdin?

Rəfiqəm: Əzizim, dəxi niyə ovqatı təlx olursan. Biz şikayət edib klublarda loto oyunun bağlatdıq. Hünəriniz var, qeyrətiniz var, siz də novruz israflarına, məhərrəm lotularına, ramazan cibgirlərinə çarə edin.

*Qızdırmalı*

---

## ŞÜHƏDA

1905-ci ildə erməni-müsəlman davasında Xankəndi qəsəbəsində otuzdan artıq müsəlman məqtul olunmuşdular. Meyidləri də Malıbəyli kəndinin yanında dəfn olunubdur. Bir vaxt var idi ki, malıbəylilər onları «şühədadır» deyirdilər. «Bağdan ərik qurtardı, salamməleyk qurtardı». Erməni-müsəlman davası yatdı, «qardaşıq» zamanı keçdi, indi isə «şühəda»ların qəbrinin üstündə nə qayırırlar: Səfərin 25-də (axır çaharşənbəsi) Malıbəyliden neçə dəstə arvadların haman qəbrlərin üstündən o tərəfə-bu tərəfə tullandıqlarını görüb soruşdum ki, onlar nə qayırırlar? «Çilə çıxardırlar» dedilər. Arvadlar dağılandan sora haman yerə gedib bu qəbrlərin baş daşlarını sınıq və torpağını dağılmış gördüm. Hətta bir parasından çoxlu qabırğalar və bir dənə kəllə çıxardıb bihörmət etmişdilər...

Mən indiyədək elə bilirdim ki, Malıbəyli müsəlman kəndidir və əhalisi müsəlmandır, amma indi onların nə olduqlarını bildim...

Və təvəqqe edirəm ki, məni bağışlasınlar.

*Cibişdanqulu*

---

## ORENBURQ XƏBƏRLƏRİ

Qazandan gəlmiş səyyar müsəlman truppası şu günlərdə Orenburqda tatar lisanında teatro oynamaqdadır. Ayaz əfəndinin «Müəllim» nam pyesi tamaşaya qoyulub əhali tərəfindən pək alqışlandı.

Teatro müsəlman və müslimə ilə dolu idi. Keçən sənələrdə mütəəssib mollalar və bəzi qaragüruh bəylər tatarca teatro oynatmamaq üçün qubernatora bir qaç kərə ərz etmiş isələr də, məqsədlərinə nail olmadılar.

Şimdi bu sənə mollalar sürüsü teatro oyununu bitirmək qəsdi ilə bu işə qərar vermək istəyirlər:

1) Cümə günü camelərdə teatronun haramlığını isbat edib əhaliyə vəz və nəsihət edib oraya getməmək üçün tənbeh edəcəklər;

2) Əgər böylə vəzlərə qulaq verməzlərsə, teatroya fidyə gedən adama baykot elan edib, o adamın heç vaxt xanəsinə getməyəcəklər, sədəqəsini, zəkavatını almayacaqlar və sair... Böylə baykot elan edərlərsə, biçarə mollalar məhəllə xalqının zəkat, əşərindən, fidyəsindən məhrum qalacaqlarını heç dərxatir etməyirlərmi? Çünki teatroya getməyən adam pək azdır.

Teatr oynavçılara yardım etdiyi üçün Ömər Divliqamov nam adama da traktir və fəhşixanadan çıxmayan ət və it bazar övliyaları da baykot edəcəklərini «Məişət» jurnalı yazır.

---

## ÜSULİ-KÜFR

Üsuli-küfr dər Təbriz çənd əst?

Pənc əst.

Əvvəl: Təbriz Əncüməninin millətin səadətinə çalışa bilməmək, onları plov yeyib, arvad alıb, saqqallarına həna yaxmaqlarının sözünü danışmaq.

İkincisi: «Molla Nəsrəddin» məcmuəsinə pul verib almaq və oxumaq.

Üçüncüsü: Sərdari-millinin millət yolunda fədakarlığına iqrar eləyib, bu qəhrəmanı məşrutə dirildən bilmək və şühədayi-hürriyyətin yetimlərinin sözünü danışmaq.

Dördüncüsü: nisvanı adam yerinə qoymaq.

Beşincisi: altıbarmağa, ocağa, Cəbrayılın qanadları ilə tutulan balığa şəkk gətirmək və həmsayələrin İrana qonaq gəlməyinin baisinin adın demək.

*İmza: Novdan buzu*

*Müdir və baş mühərrir: Cəlil Məmmədquluzadə*

Qırğız hacıları Orenburq vağzalında.




Allaha şükr, salamat gedib qayıtdılar. Bunların bərəkətindən qırğız qardaşlarımız birdən gözlərini açıb mədəniyyətin ən uca pilləsinə hoppandılar. Öz heyvanlarına Allah özü rəhm eləsin.

6 rəbiəlaxır 1328 | Beşimci il | 4 апреля 1910 г.

# ملا نصرالدين

№13 Qiyməti 12 qəpik. МОЛЛА НАСРЕДДИНЪ Цена 12 k. № 13




Osmanlı: – Bu dostlar mənə mehriban olanda həmişə evimdən bir şey yox olub. Ehtiyatlı olmaq lazım gəlir. Allaha pənah.

Litoq. S.Bıxova

## ƏDƏBİYYAT

Vəz etdiyin inandı, sən amma inanmadın,
Ya liləcəb, məgər yorulub bir usanmadın?!

—

Yatdıqca xabi-qəflət ilə millətin sənin,
Vəqf oldu layla söyləməyə xidmətin sənin,
Hər gün genəldi daireyi-hörmətin sənin,
El uğradıqca fəqrə şişib sərvətin sənin,
Millət arıqladıqca kökəldi ətin sənin.
Rüşvət haramdır, dedin, aldın, utanmadın!
Mali-yetimə – od – deyə uddun da, yanmadın!

—

Qəssabxanəni bizə darülaman – dedin,
Doğru libasına bürünüb, min yalan dedin,
Olduqsa müştəbeh, «Qələt etmə, inan!» – dedin,
Kim yaxşı söylədisə, ona min yaman dedin,
Qeyzə gəlib bərəldi gözün, ləntəran dedin.
Bir vaxt olar tanır səni hər kimsə, qanmadın!
Bu məhz bir söz idi – həqiqətdi, sanmadın!

—

Fassad olub da milləti daim damarladın,
Hər kəs əlindəkin yerə atdı, qamarladın,
Ciyfə dedikcə mali-cəhanı toparladın,
Fani dedikcə mülkə, imarət hamarladın,
Sərriştеyi-mədaxili möhkəm yumarladın.
Rüşvət haramdır – dedin, aldın, utanmadın!
Vəz etdiyin inandı, sən amma inanmadın!

—

Qövli-sərih ikən, əcəba, «mən kəfər» sözü,
Etmək desən bəhaneyi-təkfir hər sözü,
Zənnim budur ki, ortada gər olsa «zər» sözü,
Hərgiz danışma sən belə alçaq, hədər sözü,
Vicdanə, abruyə, həyayə dəgər sözü.
Bir vaxt olar tanır səni hər kimsə, qanmadın!
Ya liləcəb, məgər yorulub bir usanmadın?!

—

Cildi-qənimdə oldun əcəb gürgi-canşikar,
Nəfsin susub, yorulmayaraq oldu töməxar,
Hiylən duyuldu şimdi, sənə olmaz etibar,
Əsrari-müxtəfilərin oduqca aşikar
Qalsın – deyə səhayifi-dəftərdə yadigar,
Bir vəqt olar tanır səni hər kimsə, qanmadın!
Ya liləcəb, məgər yorulub bir usanmadın?!

*İmza: (.......)*

—

## PAKLAR

«Məkkeyi-mükərrəmədə», Səfa ilə Mərvə arasında, Mədineyi-münəvvərədə küçələrdə iki nəfər hacı gördükləri ədəmi-nəzafəti elə bir lisanitəəssürlə anlatıyorlardı ki, ciddən dilxun olmamaq qabil deyildir».

Bu sözlər yazılıb İstanbulda çıxan «Tənin» qəzetəsinin 559-cu nömrəsində və mənası budur ki, iki nəfər hacı Məkkədə və Mədinədə gördükləri çirki və zibili elə bir dil ilə nağıl edirdilər ki, müsəlmanın qəlbi qan ilə dolur.

Genə «Tənin» deyir: «Əhvali-ruh üləması bir adamın qəlbini, ruhunu, mahiyyətini anlamaq üçün onun iqamətgahını görmək pək müfid olduğunu söylərlər. Bir millətin qabiliyyət və mənəviyyatını anlamaq üçün şəhərlərini görmək və şəhərlərinə görə haqqında hökm vermək icab etsə, əcəba,







bitərəf müşahidlərin nəzəri-imtahanına nə yüzlə çıxacağız? Bütün dünyanın müsəlmanlarının ən şərif, ən müqəddəs bir ziyarətgahı olan mübarək şəhərləri öylə ədəmi-nəzafət içində buraxırsaq, bizə nə derlər? Nə desələr haqları olmaz?!.»

Bu sözlərin mənası budur ki, yer üzünün cəmi müsəlmanlarının ən müqəddəs bir ziyarətgahı bu tövr çirk içində qalıb, ətrafı üfunətləndirəndə, gör elədə bu millətin evi, həyəti, küçəsi və hətta məscidi nə halda olmalıdır?

---

Biz öz tərəfimizdən bunu ərz edə bilərik ki, cənab «Tənin» hələ uşaqdır və Məkkədən, Mədinədən belə xəbərlər eşidəndə çox təəccüb eləyir və bir az hirslənir. Amma bunu bilmir ki, dünyada hər yanda, hər məmləkətdə ki, müsəlman şəhəri var, ora bir zibilxanadır. Mən mərc gələrəm və gözübağlı bir şəhərə, ya kəndə daxil olanda bilərəm ki, burada yaşayanlar «pak» müsəlmanlardır, ya murdar rus, gürcü və ermənilər. Qoxu gələndə bilirəm ki, bura müsəlman məkanıdır və gözümü açıb görürəm ki, hər divarın dalında övrət-uşağın gözünün qabağında əlində aftaba bir qırmızısaqqal əyləşib.

Bura müsəlman vilayətidir.

---

«Tənin» indi dediyi söz həmin sözdür ki, biz 7-ci nömrədə «Nəcasət» məqaləsində demişik. Biz o vaxt yazmışdıq ki, küçə və bazarımız qoxur. İndi də «Tənin» deyir ki, «hətta ən şərif bir ziyarətgahımız olan mübarək şəhərlərimiz qoxur».

Amma yazıq «Tənin»in hələ Məşhədi-müqəddəsdən xəbəri yoxdur. Ax biçarə! Bir gəl səni aparım Xorasana, orada gör nələr var. Götür qələmi, yaz! Əvvəl başdan yaz ki, «ay türk qardaşlar, gəldim çıxdım Məşhədi-müqəddəsə və maşallah, buraları təmiz, işıq, pak və tərəqqinin ən yuxarısında gördüm və buna da səbəb müctəhid Mirzə İbrahim Kosadır».

O vədə mən deyəcəyəm ki, «yox, səhv edirsən, o deyil, Fazili Səbzəvaridir».

Birdən baxıb görəcəksən ki, birisi sol tərəfdən çıxıb deyir ki, «xeyr, Xorasanın abadlığına bais mənəm!» A gədə, bu kimdir? Bu da hacı Mirzə Məhəmməd Sərabidir.

Bəli, ağa əfv elə. Qanmamışam, bağışla. Amma bir az keçəcək sağ tərəfdən biri də çıxacaq və deyəcək ki, Xorasanı Firəngistana yetirən mənəm. A gədə, bu kimdir? Bu da Ağayi Seyid Əli Sistanidir ki, Kəlatda əyləşir.

Xub, günahımızdan keç, bir qələtdi elədik. Bundan sora təklifimizi bilərik.

«Pəh, baba, bəs məni niyə yazmırsınız ki, mən olmasaydım, indi əcnəbilərin əsgərləri tökülmüşdü vətənimizə».

Bəli, ağa, bağışla, sən kimsən?

Mən də Türbətli Ağa Şeyx Hüseynəm.

Xub, nə eybi var, səni də yazarıq.

Xülasə, elə ki, qələmi götürdün əlinə və bir şəhərə daxil oldun və istədin biləsən ki, qoxu hansı tərəfdən və haradan gəlir, o vaxt Tiflisdə həftədə bir dəfə çıxıb müsəlmanları güldürən «Molla Nəsrəddin»ə bir kağız yazasan və saniyən, əgər əhvalati-in tərəfra xastə başid, məruzi-zəmir müniri-cənabi alibudə midarəd ki, lillahilhəmd vəlminnə...

Bəndə dəxi bilmirəm də deyim; ancaq bunu deyə bilərəm ki, işlər xarabdır!..

*Molla Nəsrəddin*

---

## PAPAQ

İndiyə tək qış idi və otaqlarda o qədər odun yandırırdıq ki, isti olurdu və papaqlı oturanda şagirdlərin başı şişirdi, bir şey başa düşmürdülər. Amma indi bahardır və bir azdan sora da yay daxil olacaq. Bu cəhətdən təzə qərar qoyduq ki, dəxi bundan sora şagirdlər məktəbdə dərs oxuyan vaxt papaqsız, yəni ruslar kimi başıaçıq oturmasınlar.

Bundan əlavə, bir aftaba qərardadı var, onu da inşallah, şagirdlər eşidib və bilərlər.

*İmza: Tiflisdə «İttifaq» Əncüməni-xeyriyyəsi*

---

## ŞƏRAB İÇMƏK

Biz deyə bilmərik ki, şərab pis şeydir! Və bizə köməkçi olaraq çox müsəlman deməz ki, şərab içmək pis işdir! Bəlkə müsəlman aləminin üçdən iki payı deməz ki, şərab içmək pis işdir! Doğrudan, elə biz də deyirik ki, şərab pis şey deyil.

Çünki onda olan ləzzət və mənfəət heç bir şeydə yoxdur! Qoymur insan fikrə, xəyalata düşüb ruhunu incitsin və tülkünü aslan edir, qorxağı igid eləyir, nökəri ağa ilə, gədanı əyan ilə, ədyanı əla ilə, rəiyyəti xan ilə bir yerdə, bir süfrədə əyləşdirir. Hərçənd bu neçə sifətlər elə qumarbazlıqda da var ki, rəncbəri mülkədar ilə bərabər qoyub müsavi edir. Amma şərab lap özgə şeydir.

Bəli, şərab pis şey deyil, amma burası pisdir ki, adam bir az çox içəndə görürsən kefləndi. Keflənəndən sora da bərəkət versin, nə çoxdur pişto. Görürsən bayaq qoburdan çıxdı, çıxan kimi də açıldı, açılanda da, görürsən yoldaşın əlini, ayağını qırdı. Burası pisdir...

Şəraba pis demək olmaz, adamın ağzı əyilər, amma




– A kişi, bu laməzhəb müəllimləri niyə çıxardıb qovmuruq ki, yazaq, Mərənddən mömin müəllimlər gəlsin.




Qazanda «Hiylə Təzvirovun» şirkətinin zavodunda şəriətimizin istədiyi şərtlər üzrə qaynatu üsulu ilə tazartılub işlavi səbəbli təharətğə dürüstdür. Çünki ticarətdə bir biclik olmasa, işlər yaxşı yeriməz.

şərabı içəndən sora adam özünü və sözünü bilmir və başlayır rus qızlarına sataşmağa, müsəlman uşaqları ilə zarafat eləməyə.

Mən özüm qabaqlarda şərab içərdim. Amma indi tövbə eləmişəm, dəxi şərab içmirəm; ancaq pivə, araq içərəm. Çünki bunlardan tövbə eləməmişəm və həmişə də mənzilimdən araq əskik deyil, dükanın dalındaca qoyuram, hər yarım saatda bir rumka gedib içirəm. Bala qardaşım dükanda saxlamağa razı olmayanda qonşunun mənzilində saxlayıram.

Cəmi Yevropa həkimləri şərabın müzürr olmağın kəmahüvə həqqəhü yazıblarsa da, amma biz elə-belə sözlərə aldanıb, şərabı pisləyə bilmərik. Bəli, biz şəraba pis deməri̇k və demirik də. Hərçənd ki, şəriətimizdə də nəhydir, ancaq yuxarıda Allah var, o bilir və görür ki, müsəlmana şərab içmək çox yaraşır, çünki içən kimi gözləri qızarıb özü də igidə dönür.

*Məşədi Sijimqulu*

## ÜZR

Doğrudur, Tehranda bu il qərardad olunmuşdu ki, İran camaatı bu il Novruz bayramına artıq pul xərcləməsin. Çünki bir tərəfdən məmləkətimiz doludur acından ağlayan yetim balalar ilə, bir tərəfdən də vətənimizin halı indi o tövrdür ki, şad olmağa və evlər dolanıb noğul yeməyə gərək artıq şövqümüz olmaya.

Və lakin əziz hacılarımızın Məkkədən qayıdıb gəlməyi başımızı elə qatdı ki, Tehran da yaddan çıxdı, aclar da yaddan çıxdı. Bu barədə üzr istəyirik.

İmza: Xoy camaatı tərəfindən:

1) Ağayi Şeyx Əli ağa Pişnamaz (millətin rüknü),

2) Ağayi Mir Udil Əli ağa (cəddinə qurban olduğum),

3) Hacı Mir Yəqub ağa (cəddinə qurban olduğum).

## TƏZƏ QƏRARDAD

Bu təzə qərardad qarabağlılara da gərək çox lazım ola. Məlum şeydir ki, axır vaxtlarda tüfəng və revol saxlamağa hökumət çox çətinlik ilə izn verir. Amma Qazaxda Kosalar kəndində camaat arasında belə danışıq var ki, guya bundan sora hər bir kəs hökumətdən tüfəng saxlamağa şəhadətnamə ala bilər, amma bu şərt ilə ki, haman adam «xəbərçilik» uşkolunda oxumuş ola və camaat içindən pristava yalan xəbər və pristavdan camaata yalan xəbəri gətirməkdə mahir ola.

Hər kəs bu sifətin sahibi olsa, özünə də açılan saxlamağa izn ala bilər, hətta tanış quldura da ala bilər.

Qarabağlılara məsləhət görürük ki, bu qərardadın olmağını bilsinlər və mənfəətbərdar olsunlar.

---

## AY KİŞİ

Çəkməyə qeydi-milləti eyləmə adət, ay kişi,
Batsa tamam millətin, etmə səxavət, ay kişi,
Dərdü məlali-ümmətə olsa nəhayət, ay kişi,
Etmək olurmu onda bəs kəsbi-şərafət, ay kişi?

---

Durma ayağa, çeşmini açma bu xabdən hələ,
Dursan ayağa, başını, bil, salacaqsan əngələ.
Yuxla xorultu ilə sən əlli sənə elə-belə
Xabi-cəhalət içrə həm keyf elə, çarəs bəng elə.
Xoşdu bu cəhlü qəflət çirkü kəsalət, ay kişi,
Batsa tamam millətin, etmə səxavət, ay kişi!

---

Uyma qəzet yazanların söhbətinə, sualına,
Baxma fəqiri-müztərin yanıqlı ərzi-halına,
Vermə pulun uşaqların elm, ədəb, kamalına,
Xərc elə balü qaymağa, börkə və tirmə şalına.
Beşcə günü ye-iç kökəl, çağ-səlamət, ay kişi,
Batsa tamam millətin, etmə səxavət, ay kişi!

---

Alma qəzet, haramdır, jurnala vermə dirhəmi,
Ruzi-cəzadə alnına çəsb edəcəkdilər həmi,
Rəngi-həna yaxıb qızart, cəm elə rişi-bərhəmi,
Qoyma cərahəti-dili-millətə elm mərhəmi
Dərdinə qalma bir kəsin, qopsa qiyamət, ay kişi,
Batsa tamam millətin, etmə səxavət, ay kişi!

---

Əzbər elə dilindəcə kəlmeyi-küfri dəmbədəm,
Aləti-kəsb əlindəcə eylə şəriəti, nə qəm,
Qurşağı bağla, kürkü sal çiyninə, ol da möhtərəm,
Qüslü təharət ilə hey dəng elə xəlqi, lacərəm.
İstəsələr də bir qəpik vermə ianət, ay kişi,
Batsa tamam millətin, etmə səxavət, ay kişi!

*Kefsiz*

---

## XÜSUSİ MÜXBİRLƏRİMİZDƏN TELEQRAF

Nuxa – Bu gün buradakı darülfünunun ümum üləma, füzəla və üdəbaları hazır olduqları halda imtahaniümumi icra olundu; belə ki, məşhur mübəlliğ (Topqarqaç) Hacı Abdulla əfəndinin tələbələrindən əliyül-əla dərəcədə 4 nəfər təbəqatül-ərz, yəni (qorni injener) rütbəsi ilə və on sənə müddətlə İrkutski quberniyasına və məşhur məxfərətfüruş Rəsul əfəndinin tələbələrindən ali dərəcədə üç nəfər kəşfiyyat üçün on beş sənə müddətlə qütbi-şimaliyə, yəni Yakutski oblasta

Və məşhur (ibndolojans) Nurməmməd əfəndinin tələbələrindən əla dərəcədə beş nəfər silahşurluqdakı məharətlərinə görə on sənə müddətilə Uraldakı silah zavoduna, yəni Perm quberniyasına

Və məşhur Puruşkeviç Mustafa əfəndinin tələbələrindən əla dərəcədə dörd nəfər «zövci-axər» elmində yədi-tula sahibi olduqlarından yeddi sənə müddətlə Odesə Məmdəlinin haramxanasına

Və məşhur ikinci şeyx Vəhdəti Qışlaqlı Həsən əfəndinin tələbələrindən əla dərəcədə yeddi nəfər sinəzənlikdə məharət kəsb eləməklərinə binaən üç sənə müddətlə zərbxaneyi-amiriyə yəni, Şellisburqdakı Çekannı dvora

Və dəsaisi-məlanət ilə məşhur və məruf, surəti-zahirdə qazi, amma həqiqət halda xanəsində iki sənədən bəri istirahətnişin cənab Əbdürrəhim əfəndinin tələbələrindən elmi-xəbasatda yədi-tula sahibi üç nəfər dövlət dumasında «xas rus firqəsinin» fəxri katibliyinə Peterburqa.

Cəmən yekun iyirmi iki tələbə diploma, yəni mükafat alıb islam aləmini övci-əlaya qalxızdılar və nəhayətində məşhur mübəlliği-məxfirət və millətfüruş cənab Hacı Abdulla əfəndi tərəfindən bir ayini-ruhani icra olundu və cümlə islam aləmindən təbrik teleqramları gəldi. Və haman günü qəyur mücahidlər üçün munisipalitet, yəni şəhər idarəsi tərəfindən əhzar olunmuş xüsusi arabalər ilə və hökumət tərəfindən təziman tərfiq olunan bir bölük əsgərin müşayiəti ilə və əhalinin alqışları arasında Yevlax stansiyasına rəvan oldular.

Və əsnayi-rahda qəyur mücahidlər və böyük vətənpərvərlərin hər bir nəvaçisi ikmal olunduğu kimi ruhipüməvazlarını oxşamaq üçün avtomatiçeskaya muzıka, yəni (növi-icad) musiqi də əhdə olunmuş idi.

Məsələn, mücahidlər iyirmi iki nəfərdir, bunların hərəsinin boynuna, sinninə, qəddinə, qamətinə görə dəmirdən məmul zəncir sistemində bir alət qayırır və bu zənciri mücahidlərin baldırlarına braslet, yəni bilərzik hesabında keçirirlər və zəncirin yuxarısını toqqaya bənd edib kəmər hesabında mücahidin belinə bağlayırlar və bu zəncirlərin bəndləri elə müdəqqiqanə emal olunub ki, biri-birindən səsdə fərqlidir.

Məsələn, biri bəm isə, o biri zildir. Vəqta ki, ümum mücahidlər yerişə başlamış, muzıka kəndi-kəndinə çalınır və «həmidiyyə» marşı çıxır və bu musiqinin isminə burada «qandal» deyirlər.

## ÜSULİ-CƏDİD DƏRSİ

(Darülpuşyan məktəbində)

Xacə – Sakit olun!
Əlif – Nə kimi?
Cavab – Əlif çubuq kimi.
Ba?
Ba təknə kimi.
Ta?
Ta ona bənzər, sa ona bənzər.
Cim?
Cim qarnı yarıq, ha ona bənzər, xa ona bənzər.
Dal?
Dal dibək kimi, zal ona bənzər.
Ra?
Ra oraq qıçlı, za ona bənzər.
Sin?
Sin üç dişli, şin ona bənzər.
Sad?
Sad başı böyük, zad ona bənzər.
Ta?
Ta dovşan qulaq, za ona bənzər.
Ayn?
Ayn ağzı açıq, ğayn ona bənzər.
Fa?
Fa quzu başlı, qaf ona bənzər.
Kaf?
Kaf beli əyri, lam ona bənzər.
Mim?
Mim çomaq kimi, nun çanaq kimi.
Vav bir gözlü, ha iki gözlü, lam əlif la və ya əyri-büyrü.
Gördünüzmü üsuli-cədidi?
Allah bəd nəzərdən saxlasın.

---

## ƏBYAT
## MEŞƏ

Orenburqda «Din və məişət» jurnalından zühur etdiyi bu heyn bir zali musəbəyi din bətal dedi qalmas cəhənnəmdə möbit əsla küffardan.

Şu rəsmə etdi dəvayi-nicatı-külli-insanın irişur dedi üqbada ümumi rəhmətullahdən.

İskisloveçdə imam Seyid ibn Şərafəddin

Molla Nəsrəddin: Başını piyliyim?.. Ay belə şair.

*Müdir və baş mühərrir: Cəlil Məmmədquluzadə*




Ağa, buyur, buyur.

Ərfəüddövlə: Xeyr, məni bağışlayasınız. Mən bilirəm ki, yağ əvəzinə plova zəhər tökübsünüz ki, məni tələf edəsiniz, dəxi məni görə bilməzsiniz. Pulları göndərdim Amerika banklarına, özüm də qaçdım Firəngistana.

13 rəbiəlaxır 1328 **Beşimci il** 11 апреля 1910 г.

# ملا نصر الدين

№14 Qiyməti 12 qəpik. **МОЛЛА НАСРЕДДИНЪ** Цена 12 k. № 14




Litoq. S.Bıxova

## ƏDƏBİYYAT

Bir bölük boşboğazıq, heyvərəlik adətimiz,
Doludur lənət ilə, qeybət ilə söhbətimiz,
Oxumaqdan payımız yox, yazıdan qismətimiz,
Bu avamlıqla belə hər sözü təfsir edərik,
Mümkün olduqca müsəlmanları təkfir edərik.

—

Hər sözə çulğaşarıq, hər bir işi qurdalarıq,
Harda bir nur görürsək, ona qarşı olarıq,
Bəzinə diş qıcıdıb, bəzinə quyruq bularıq.
Bizə hər kəs çörək atsa, onu təqdir edərik,
Mümkün olduqca müsəlmanları təkfir edərik.

—



Deyilik naşi, bu işdə ağarıbdır yalımız,
Bilirik dini-müsəlmanı bu gün öz malımız.
Üzü qırxıq deyilik, bir şələdir saqqalımız,
Tərpədib xeyrə onu, aləti-təzvir edərik,
Mümkün olduqca müsəlmanları təkfir edərik.

—

Gedərik məscidə hər gün, qılarıq onda namaz,
Xüşkə möminlik edib, başlayarıq razü niyaz,
Məscid olsun, alarıq satsa çocuqlar bizə naz,
Bu uşaqbazlığı biz zöhd ilə təstir edərik,
Mümkün olduqca müsəlmanları təkfir edərik.

—



Danışıb söyləşərik hər necə ünvan olsun,
İftira, ləğv, əbəs hərzəvü hədyan olsun,
Hər kəsə bağlayırıq hər cürə böhtan olsun,
Qoy bizim din evimiz olsa da viran, olsun.
Güc verib zikrə, cinan qəsrini təmir edərik,
Mümkün olduqca müsəlmanları təkfir edərik.

—



Mömінik, keflənərik arizuyi-cənnət ilə,
Oxumuşlar adını yad edirik lənət ilə,
Düşmənik elm ilə, insaf ilə, hürriyyət ilə,
Biz bu əfsanələri cəhl ilə tənfir edərik,
Mümkün olduqca müsəlmanları təkfir edərik.

—

Ölkəni seyr edirik, hər cürə insan görürük,
Ancaq öz nəfsimizi pak müsəlman görürük,
Bu xəyal ilə yatıb hurivü qılman görürük,
Xabi-sadiq deyə bu haləti təbir edərik,
Mümkün olduqca müsəlmanları təkfir edərik!

*İmza: ......*

---

## NADİRÜL-VÜCUD

Bu yavuqlarda bizim sahibi-mənsəblərdən birinin ölüm xəbərini qəzetlərdə oxuduq. Məlum şeydir ki, cəmi yaranmışlar öləcəklər; torpaqdan xəlq olunanlar genə axırda torpağa qayıdacaqlar.

İnna lillahi və inna ileyhi raciun.

Öləcəklər padşahlar, öləcəklər gədalar, öləcəklər abidlər, öləcəklər kafirlər və lakin zəmani ki, başmaqlar gəldi ortalığa və mizan tərəzi quruldu, o vədə mən sənin keyfini xəbər alacağam.

Əzizim, indi sənnən işim yoxdur, indi dövran səpindir; ye, iç, otur ali imarətdə. Amma görərəm, görərəm, halını görərəm, bəradərim! Bunu bil ki, o vədə peşimanlıq bir səmərə bağışlamaz. Necə ki, vaizi-şəhir buyurublar:

Cəhd kon del zendə gərdəd, tən çe arayi bezər?
Mordera sudi nədarəd gure-por nəqşü nigar*.

Amma genə başa düşmədim ki, bu yavuqlarda vəfat edən bir vücudun barəsində niyə o qədər çığır-bağır saldılar. Mərhumun adını qəzetələrin birində qoymuşdular «nadirül-vücud». Lüğəti açıb baxdım, gördüm «nadirül-vücud» o şəxsə deyirlər ki, millət yolunda heç bir əlahiddə səy və qeyrət göstərməyə və «bir kəs məndən inciməsin» deyib ömrümün əvvəlindən axırınadək çalışmalı yerdə rahat otura evində və öləndə də Qafqaza elə şöhrət sala ki, xəlq onu doğrudan da millət mücahidi hesab edə.

Nadirül-vücud imiş.

---

Mərhumun ruhundan üzr istəyib və qohum əqrəbasına sər-səlaməti deyib keçək mətləbə.

Mən belə görürəm ki, camaatımızın içində, mollaları çıxandan sora, tərəqqi və maarifimizi təxirə salan haman ağayi-möhtərəmlərdi ki, bu yavuqlarda vəfat edən «nadirül-vücuda» oxşayırlar. Avam camaat nə qanır? O da baxır əvvəl mollalarına və seyidlərinə, görür ki, seyid Məhəmməd Şirvani çıxıb minbər üstə və deyir:

– Bir gün Musa Allah-taala dərgahından istida elədi ki, cəmi qəzet yazanların barmaqlarını şil eləsin. Bir gün gözlədi, Allahdan cavab gəlmədi, iki gün gözlədi, Allahdan cavab gəlmədi, axırı Musa əleyhissəlam səbr edə bilməyib başladı Aşqabadın küçələrini gəzməyə ki, zehni bir az açılsın və Yaşkanın padvalının bacasından baxıb görüb ki, Seyid Məhəmməd Şirvani əyləşib, qabağında basdırma kabab və bir uzun ərizə və o ərizədə yazılıb ki, filan qəzet yazan – kafirdir; ondan ötrü ki, dinə sataşır. Molla İsmayıla sataşır. Seyid Məhəmmədə sataşır.

---

Əgər Aşqabadda Seyid Məhəmməd Şirvani bir belə qonaqlıq tərtib edə, əvvəl-qabaqca basdırma kababını yeyib haman təkfir ərizəsinə qol qoyanlar olacaqlar Aşqabadın «nadirül-vücud» ağaları, ondan sora: Molla Xoruzullah, Molla Müseyib, Molla Heydər Tuliyev, Hüseyn Zal, Ömər Xoca, Kərbəlayi İbad qəssab, Hacı Əbdüləli hamamçı və cəmi behiştə gedənlər.

Bunun səbəbi nədir? Səbəbi budur ki, bu vücudlar əgər istəsələr Seyid Məhəmməd Şirvaninin xilafına getməyə, o da avam camaatı başına yığıb bunları kafir qələmə verəcək ki, nüfuzdan düşsünlər. «Dəxi nə işim var, qoy canı çıxsın, kaş mən rahat olum».

Vladiqafqazda hətta «ədib»lərimiz Molla İsmayılın səsini eşidəndə siçan dəliyini satın alıb konsulxanalarda gizlənirlər. Söz yox, axırda bu ağaların adını millət mücahidi qoyacağıq ki, bu, ədəbli dolanıb və hicab məsələsi barəsində mollalara «bəli, bəli» deyib. Amma bunu lazımdır nəzərə almaq ki, məsələn, Gəncədə, yəni müsəlmanların Oksfordunda bu qədər oxumuşların varlığı ilə əgər tək bircə Ələkbər bəy Rəfibəyov olmuya, heç bir kişi öz övrətilə cürət eləyib küçəyə çıxa bilməz.

Məsələn, Molla İsmayıl Həsənzadə kimi bir molla məhərrəmdə minbərdə qaradovoya dua eləyəndə Ələkbər bəy Rəfibəyovdan savayı bir «millətpərəst» haman mollaya bir söz demir ki, «mollalar və camaat məndən inciməsin...»

Odur ki, Ələkbər bəylər də Bala seyidlərin xoşuna gəlmir ki, bu gün mollanı incidəndə sabah da məni hədələyəcək ki, aşura günü bəzədiyim atın altından müsəlman övrətlərini keçirib hərəsindən tovlayıb 1 manat almayım. Mən də acığnan gedərəm, hökumətə danos verərəm.

Lənət şeytana.

---

«Nadirül-vücud»un mənası bizim lüğətdə bu idi ki, ərz olundu. Əgər özgə bir mənası da var, qoy, bilənlər desinlər.

*Molla Nəsrəddin*

---

## XOKƏNDDƏN MƏKTUB

Möhtərəm Molla Nəsrəddin əmi həzrətləri! Əgər bu sözüm üçün Allah mənə qəzəb eləməsəydi, cənabınızdan bircə bir sual sorardım. Siz də mənə cavab yazıb, bir saili məmnun edərdiniz.

Mən Xokənddə duran kazanlı bir tatar oğlu olduğumdan, bir neçə illər bundan qabaq Bakı şəhərində durmuşdum. Bakılı qardaşlarımız hər ildə, məhərrəm ayında aşura günündə baş vurub qan tökmələrini gördüm: mərsiyəxan mənbərdə oxuyur, on beş iyirmi adam palazda rubəru oturub yumruqları ilə biri başına, biri kürəyinə,

---

*Cəhd elə ürəyin sağ olsun, bədəni nə qızılla bəzəyirsən?
Ölü üçün qəbrin bəzək-düzəyinin xeyri yoxdur. (Red.–T.K.)

Hicab məsələsinə dair



– Qoy molla göbəyimi yazsın, bunun zərəri yoxdur.




Мужъ – Открой лицо: докторъ долженъ посмотреть тебе горло.
– Ay arvad, aç üzünü, həkim boğazına baxsın.
– Нетъ, нетъ ни за что не открою.
– Yox, yox, ölsəm də açmanam.

Сборъ пожертвованій для мусульм.
Благотварит. общества въ Тифлисе.




Ermənilər tərəfindən:
– Baş və can ilə qulluq etməyə hazırıq, ta ki, müsəlman camaatı da tərəqqi eləyib özgə millətlərə çatsın.

Müsəlman cəmiyyəti-xeyriyyəsinə köməklik.




Müsəlmanlar tərəfindən:
– Yox, yox, xozeyin dükanda yoxdu, mən bir şey verə bilmənəm (və halonki xozeyin özüdür).

bir də saçlardan dartırdılar. Bundan sora baş vuran yerə vardıq, başları xəncərnən vurub qan çıxardanlı gördük. Bu işlər bizim tatarlarda adət olmadığından, çox diqqətnən baxdıq. Mən gördüm: yumruqnan baş vuranlar, zəncirnən arxa vuranlar, xəncərnən vurub başdan qan çıxaranların hamısı fəhlələr, həmşərilər, kasıblar və Saldat bazarının baqqallarına oxşayırdılar. Mərsiyəxandan, əmmaməli molladan, dövlətli müsəlmandan və oxumuş ziyalılardan heç bir kişi olsun, özünü vurub savab istəyən müsəlman görmədim.

A Molla əmi həzrətləri! Deyin görək, bular nə üçün özlərin vurub savab istəmirdilər? Baş vurmaq fəhlələrə və kasıb adamlara fərz olub, dövlətli və ziyalılara harammı? Bu mərsiyəxanlar, əmmaməli mollalar həm özlərini vurub savab alsalar olmazmı idi? Bu cür savab qafqazlılara lazım ikən, kazanlılara lazım deyilmi?

A molla əmi! Əgər bu iş savablı olsa, tərəqqi və mədəniyyətə rəhbər isə, biz kazanlı və türkmənistanlı müsəlmanlar həm qəbul edib başımızı o qədər vuraq ki, bir vuruşdan iki parça eləyib tez mədəniyyətə çatdırsın və bizim bu sənaətimizi digər millətlər də görüb öyrənsin.

Bizim bu sualımıza cavabı istər jurnalnan, istər ayrı kağızda cavab versəniz, Allah ömrünüzü uzun eləyib, savabları gorunu nəsib eləsin.

*Xeyirxahınız: Şagird Xokəndi*

*30 mart 1910-cu il*

---

## GÖZÜAÇIQ

Urmi.

«Tənəş dəva nəpəzirəd təbibra çe günah»*.

İnsan özü tənbəl olub öz bədbəxtliyindən şikayət edərsə, ona deməli ki, neçə min ildir ki, İran hökumətinin xatir və xəyalına gəlməzdi ki, Urmi şəhərində və həm kənarında gömrükxanalar təsis edib və malütticarədən hər qism gömrük alsın. Amma ayrı dövlətlərin gözləri bizim kimi bağlı deyil, belə zadları çox tez bilərlər. Məsələn, həmsayəmiz Osmanlı dövləti Urmiyə şəhərinin iki saatın məsafəsində Cəbəl adlı İran kəndində bir başı fəsli və dörd nəfər kürd qoyub İran tüccarından hər yük başına (nə olursa olsun) altı qrandan altı tümənə kimi həqqül-mürur və gömrük alır. Doğrusu, indiyə qədər Urmiyənin öz rəsmi gömrükxanası belə işləsəydi, İran hökuməti mücəddədən istiqraz fikrinə düşməzdi.

Yaşasın gözüaçıqlar, payidar olsun cəhəti-camiyyəti-islamiyyət.

*Başmağı yırtıq*

---

## TEHRAN

Tehran məclisi-bələdiyyəsində şəhərin küçə və xiyabanlarının təmizliyi və tənzifi barəsində neçə dəfələr söhbət olunub, axırda səlah bunda görüb və qərar veriblər ki, indilikdə küçə və xiyabanlara əl vurmasınlar.

Çünki bundan sonra aeroplan (aeroplane) və balon, drijabel (Derjable) ilə səfər və gəzmək olunacaq, dəxi küçə və xiyabanlarda gəzmək olmayacaq. Bu surətdə məxaric və məsarif eləyib zibili və it-pişik ölülərini götürmək lazım deyil və bir təzə xəbər də budur ki, bələdiyyə vəkilləri əksəriyyəti ara ilən Hacı Seyid Həsən ağa

*Davamı səh.7-də*

---

**FELYETON**

# OSMANLI MƏKTUBLARI, İSTANBULDA İRANLILAR

Atalar doğru deyiblər ki, yer insanı gülləndirər, nəinki insan yeri. Məsələn, Naxçıvan və Şamaxı məclislərində yuxarı başda oturan bəy, xan və mollalar oturduqları yerin «hava»sından gərdənlərini elə çəkirlər ki, guya iranlılar qədim vaxtları sitayiş etdikləri sənəmlərdir. Necə ki, indi İstanbulda iranlıların məhərrəmlik dəstəbaşısı Hacı Səməd küçədə 12 yaşında bir türk çocuğunu görəndə başlayır oxumağa:

Mənim qüssəm bu qürbətdə nə bir qüssə, nə qəmdəndir,
Mənim dərdim və lakin qırmızı fəsli sənəmdəndir.

Bəli, qürbətdən danışırdıq. Əvvəl, qabaqca möhtərəm oxuculara ərz olsun ki, bizim mömin və müqəddəs iranlılar İstanbulu doğrudan da Təbrizə oxşadıblar; yəni hər iki dünyada xoşbəxt eləyiblər. Məsələn, götürək teatr işlərini. Yəni necə teatr? Yoxsa sən istəyirsən ki, iranlıların da teatrı firənglərin teatrına oxşasın? Əgər belə deyirsən, dəxi qələmi qoyum yerə sakit olum. Bəli, eşitdik ki, iranlılar dekabrın 39-da bir teatr gətirəcəklər. Mən də getdim. Yəni sözün nədir? Məgər islam aləmindən xəbərin yoxdur? Kafirlər içində belə pis qayda var ki, teatrda iki min cəmiyyətin içində bir öskürən yoxdur. Bu nədəndir? Ondan ötrü ki, kafir firənglərin içində məşrutə yoxdur, onunçün istibdadın qorxusundan öskürmürlər. Amma müsəlmanlar, necə ki, hər yanda azaddırlar, necə ki, övrəti boşamaqda və boşamamaqda, yainki gecələr səhərə kimi evə gəlməkdə, ya gəlməməkdə, yainki çaxır içib keflənməkdə, ya keflənməməkdə.

Bəli, azad millət hər yanda azad olar. Odur ki, İstanbul iranlılarımız da teatrda heç kəsdən qorxmayıb ürəklərini sıxmırlar, danışmaq istəyəndə danışırlar, çubuq, siqar çəkmək istəyəndə çəkirlər. Hərçənd İstanbul kimi yer üzündə bir böyük və məşhur şəhərdə iranlıların teatrında elə bir qoxu var idi ki, İrəvanda məscid həyəti yada düşürdü. Amma bir de görüm sözün nədir? Yoxsa istəyirsən ki, qış vaxtı pəncərəni açıb xalqı soyuğa verələr?

Bir də sən iranlılara bunu irad tutursan ki, səndəl nömrələri düşüb itmiş idi, loja bileti götürən ayaq üstə durmuşdu, pulsuz adam lojada oturmuşdu, əgər sən belə deyirsən, di pəs eşit gör nə cavab alırsan.

Bu da qalsın gələn nömrəyə.

*Məşədi Mozalan bəy*

*.Bədəni dərman götürmürsə, həkimin nə günahı?

bələdiyyə vəkilindən iltizam aldılar ki, bundan sonra altı ayda bir dəfə hamama gedib və üç ayda bir dəfə köynək-tumanı əvəz eləsin. Ondan ötrü ki, bu vəkil ağanın saqqalının mikrobları və paltarının kəsafətləri bələdiyyə vəkillərinin şəninə toxunurdu. Hər kimsə onu görəndə deyirdi bələdiyyə vəkili öz saqqalın təmizləmir, İranın paytaxtını necə təmizləyəcək? Və bir də qərar verdilər Hacı Seyid Həsən ağa dərs oxusun.

*İmza: Xudri keçəl*

---

## KASPİNİN O TAY XƏBƏRİ

Xivə – bu il Daşhovuzunda, Kurlanda, Şahabalda yaxşı sel qurdular. Lakin Daşhovuzun seli çox cəlallı oldu.

---

Ürgənc – bu il Allahverdi bəy həkim Ürgəncdə sel qurmaq icazəsini vermədiyindən, mütrüblər və sərçəbazlar Xivədə vəzirlər şurasına hakimin tərəfindən protest teleqrafı vurdular və teleqrafın cavabına səbr edə bilməyib Buxara əmirinə teleqraf vurub özlərini əmirə rəiyyət olmaqlarını təklif etdilər. Əmir həzrətləri tək bircə mütrüblərin ərizəsini qəbul edib qalanlarınkını rədd etdi.

---

Türküstan – Arpa satan Curabay vətənin və millətin tərəqqisi yolunda səkkiz min manat oğlunun xətnə toyuna xərc qoydu. Böyüklərə xələtlər verdi, at çapanlara neçə dənə keçi verdi və Məhəmməd Əminbay ilə Əhmədçağın vərəsəsi hərəsi min manat verib millətin başını ucaltdı və bu pulların hamısı təzə il münasibəti ilə mart ayının 17-də Namazgah meydanında «sil» səyahətinə sərf olundu. Xərclənən pulun cəmi 9 min manat oldu. Dəxi bundan sora deməsinlər ki, türküstanlılar bu əsrdə insanlar arasında Allahın kərəmindən insana oxşamırlar.

---

Aşqabad – Naxçıvanlı Salman dəlləyin qaynatası neftfüruş Abdulla istəyirdi öz qızını Salmandan boşatsın. Axırı Salman naxoş olur və fürsət ələ düşür. Abdulla gedib imam seyid Məhəmmədi qoyur faytona, gətirir Salmanın evinə və Salmandan iqrar istəyir ki, övrəti boşasın. Salman heç bilmir ki, bundan nə istəyirlər. Ağa o saat talağı oxuyur. İndi Salman yaxşı olub və övrətindən əl çəkmək istəmir, ağa da cavab verir ki, «qırışmal, ölürdün öləydin, sənə kim dedi diril, mən elə bildim ki, sən daha qurtdamıyacaqsan və təlaqi-xəli oxudum, dəxi sən o övrəti ala bilməzsən».

---

## MÜSƏLMAN ŞƏHƏR İDARƏSİ

Keçən nömrəmizdə yazmışdıq ki, Orenburq vilayətində Qarğalı şəhərinə oxşar Qafqazda bir şəhər mövcud imiş və çox ola bilər ki, bir para oxucularımız elə zənn edələr ki, biz Nuxa şəhərinə sataşmaq istəmişik, ona binaən bu şəhəri layiqincə qareini – giramə tanıtmağı borc bildik.

Məlum olduğu üzrə Nuxa şəhər idarəsi dörd ilin müddətində şəhəri bu gunə abad ediblər: 1) Şəhərin müxtəlif cəhətindən dörd böyük küçənin açılması və bu küçələri Odes tərtibi ilə paket daşıyla təfrişi və səkilərin də genə taxta ilə təfriş və bu küçələrin elektrik ilə işıqlanması. 2) Qışlaqdan Dərdisə qədər olan küçə boyu elektrik tramvayı və elektrik işığı. 3) Salınçıqdan Dəbbəxana yolu ilə yuxarı başa qədər olan küçənin fərşi və 125 ədəd Vaşinqton fanarı. 4) Və şəhərin ortasından axan Qoçan çayının müxtəlif cəhətindən 8 ədəd asma dəmir körpü və məzkur çayın digər 8 cəhətindən yeraltı dəmir yolu, yəni tunel. 5) Sarıtorpaqdan Şeytanbazara və Dəbbəxxanadan Sarı quyuya iki tunelin güşadı. 6) Üçü yuxarı və üçü aşağı bazarda olmaq münasibəti ilə altı meydanın güşadı. 7) Hər birisi 25 kraovatlı iki xəstəxananın güşadı və məzkur xəstəxana istemal olunmaq üçün on beş ədəd yaylı ərəbə. 8) Küçələri sulamaq üçün 75 ədəd su ərəbəsi. 9) Şəhəri yanğından mühafizə üçün mükəmməl bir yanğı söndürən dəstəsi. 10) Şəhərin nəzafətinə, təmizliyinə və səhiyyə idarəsinin hər bir ehtimalına qarşı hazır olması üçün 4 həkim, 16 cərrah və 82 ədəd səhiyyə məmuru, yəni «sanitarnı popeçitel» və bunların ziriidarəsində istemal olmaq üçün 125 örtülü, 126 yaylı və 129 mühafizəli ərəbə. 11) İnşaat komissiyası tərəfindən şəhərin müxtəlif cəhətlərindəki binaların bir planda olmağına görə 118 dükan, 8 hamam, 3 karvansara, 4 mehmanxana və 5 məktəbin sökülməsi. 12) 5 ibtidai, 3 rüşdi və bir gimnaziyanın güşadı. 13) Şəhərin ən dilgüşa və dilrüba cəhətində üç bulvarın güşadı. Və ənqərib bir zamanda şəhər teatrosunun binası və bələdiyyəcə təsəvvür olunan qız məktəbinin binası və şəhərin bivayə və bikəs uşaqlarının təlim və tərbiyəsi üçün iki ədəd priyut, yəni yetimxana və iki ədəd «boqadelniya», yəni kor, kar, topal, çolaq adamların yolçuluqdan və dilənçilikdən xilas olmaq üçün ehsanxana. 14) Şəhərdə nizam və intizamı bərpa etmək və bir hadisə meydan verməmək üçün şəhərin on hissəyə, yəni «çasta» təqsimi və büro, yəni «adresni istol» tərtibi. 15) Şəhər zavod və fabrik əmələsinin şəhər idarəsi tərəfindən hər şənbə günləri əhvali-səhiyyələri müayinə olunması və on beş yaşından yuxarı fabrik və zavodlara əməl ilə qəbul olunmaması və i.a.

## POÇTA QUTUSU

Yekaterinodarda – M. zadəyə: Yazırsan ki, konsul Kərimxan səndən iki manat əvəzinə beş manat bilet pulu aldı. Bu barədə bundan artıq bir şey yaza bilmənik, çünki əhvalatdan xəbərimiz yoxdur və sizi də tanımırıq.

Bakıda İ.H.zadəyə: Yad adamların yazdıqlarını çap etmirik.

***

Gədəbəy mədənində S. cənablarına: Çox uzundur, heç vəch ilə çap edə bilmənik. Bir neçə sətir yaz göndər – baxaq.

*Müdir və baş mühərrir: Cəlil Məmmədquluzadə*




– Hələ çox başlar bu qayaya dəyib dağılacaqdır.
– Пока еще много головъ разобьется объ эту скалу.

20 rəbiəlaxır1328 **Beşimci il** 10 апреля 1910

# ملا نصر الدين

**№15 Qiyməti 12 qəpik.** **МОЛЛА НАСРЕДДИНЪ** **Цена 12 k. № 15**

Küsufi-külli (günün tutulması)




Rus misyonerləri həmişə deyirlər ki, «köhnə fikirli mollalar bizim mənəvi dostlarımızdır».

## ƏDƏBİYYAT

### OXUTMURAM, ƏL ÇƏKİN!

Oğul mənimdir əgər, oxutmuram, əl çəkin!
Eyləməyin dəngəsər, oxutmuram, əl çəkin!

Gərçi bu bədbəxt özü elmə həvəskardır,
Kəsbi-kamal etməyə səyi dəxi vardır.
Məncə bu işlər bütün şiveyi-küffardır,
Dinə zərərdir, zərər!.. Oxutmuram, əl çəkin!
Eyləməyin dəngəsər, oxutmuram, əl çəkin!

Bəs ki, uşaqdır hələ, yaxşı-yaman qanmayır,
Elmin əbəs olduğun anlamayır, qanmayır
Sair uşaqlar kimi hər sözə aldanmayır
Eyləyir ömrün hədər, oxutmuram, əl çəkin!
Eyləməyin dəngəsər, oxutmuram, əl çəkin!

Eyləmərəm rəhm onun gözdən axan yaşına,
Baxsın özündən böyük öz qoçu qardaşına,
Ölsə də verməm riza şapka qoya başına,
Kafər ola bir nəfər, oxutmuram, əl çəkin!
Eyləməyin dəngəsər, oxutmuram, əl çəkin!

Uşaq mənimdir, baba, dəxli nədir sizlərə,
Kim sizi qəyyum edib hökm edəsiz bizlərə,
Yatmaram əsla belə dinə dəyər sözlərə,
Bir kərə qan, müxtəsər, oxutmuram, əl çəkin!
Eyləməyin dəngəsər, oxutmuram, əl çəkin!



Qoysanız öz oğlumu mən salım öz halimə,
Sənətimi öyrədib, uydurum əhvalimə,
Dün bu oxutmaq sözün, ərz elədim alimə,
Söylədi «haza kəfər», oxutmuram, əl çəkin!
Eyləməyin dəngəsər, oxutmuram, əl çəkin!

Bəsdi, cəhənnəm olun, bunca ki, aldatmısız,
İndi beş ildir tamam dinimə əl qatmısız,

Sevgili övladımı kafərə oxşatmısız,
Duydum işin sərbəsər, oxutmuram, əl çəkin!
Eyləməyin dəngəsər, oxutmuram, əl çəkin!

Satmaram öz ağlımı siz kimi laməzhəbə,
Razıyam oğlum gedə qəbrə, nə ki, məktəbə!
Məktəb adın çəkməyin, mələbədir, mələbə!
Əlhəzər ondan, həzər, oxutmuram, əl çəkin!
Eyləməyin dəngəsər, oxutmuram, əl çəkin!

Bəsdi o bildikləri, kaş onu da bilməsə!
Canıma olsun fəda bir də üzü gülməsə!
Ta ki, o zehnindəki fikirləri silməsə,
Sanma ola bəxtəvər, oxutmuram, əl çəkin!
Eyləməyin dəngəsər, oxutmuram, əl çəkin!

Fikrimi verməm əbəs siz kimi nadanlara
Sövq edəsiz oğlumu bir para hədyanlara.
Çünki xəyanətçisiz cümlə müsəlmanlara,
Mənzilinizdir səqər, oxutmuram, əl çəkin!
Eyləməyin dəngəsər, oxutmuram, əl çəkin!
Dinə zərərdir, zərər, oxutmuram, əl çəkin!

*İmza: (..........)*

---

## ŞÜMR ƏLİNDƏN

*(Ey dad Şümr əlindən*
*Fəryad Şümr əlindən)*

Oxucularımızdan təvəqqe edirik ki, 5-ci nömrəmizi əllərinə alan kimi iki rükət vəhşət namazı qılıb, üç təsbeh lənət oxusunlar.

Oxusunlar kimə? Şümrə? Xeyr, bə kimə?

Di qulaq as, başdan nəql edim.

---

Qardaşlar, vallah, lap ağlım çaşıb, xeyir-dua söyləyəndə də bilmirəm kimə söyləyim: O qədər müstəhəqqi var, o qədər talibi var, bazarı o qədər rəvacdır ki, növbə üstə dava düşür.

Bir tərəfdən Odesdə bakılı Məhəmmədəli kənarda durub havada uçan drijabl gəmisinə həsrət ilə baxıb fikir eləyir ki, Allahın altında bu mənim olaydı, bəhayim gənc ilə və qarabağlı Rəhim xan ilə minib çoxlu dinamit və bomba götürüb gedəydim düz viranə qalmış İranın üstünə və şəhərləri, kəndləri bomba ilə dağıdıb genə qayıdaydım Odesə və yoldan keçəndə Bakıda gimnaziyada oxuyan müsəlman qızlarının bir balacasına elçi göndərəydim. Qız da qorxusundan dərsini yarımçıq qoyub baş götürüb qaçaydı.

---

Ey dad Şümr əlindən. Və lakin bu «dadü fəryadın» dəxli Ağazadəyə yoxdur, Ağa elə xəyal eləməsin ki, mənim o alicənabdan bir narazılığım var. Haman Ağazadəni ərz edirəm ki, Ağayi Xorasaninin oğludur. Hərçənd Ağa qafqazlı cavanlarımıza çox əziyyət verib ki, niyə teatr işlərinə mübaşir olurlar.

Əhvalat bu qərar iledir ki, rəbiəl-əvvəl ayının 23-də qafqazlı cavanlarımız Məşhədi-müqəddəsdə bir teatr gətirdilər və Nəcəf bəy Vəzirovun «Yağışdan çıxdıq yağmura düşdük» adlı komediyasını tamaşa səhnəsinə qoymuşdular. Çox gözəl də oynadılar, amma hər nə qədər ki, ləzzəti var idi, Məşhəd mollaları cavanların burunlarının dəliyindən gətirdilər. Bu da ittifaq bir iş oldu. Yəni Ağazadənin övrəti mərhum olmuşdu, özünə təzə bir qız axtarırdı (genə Bakı yadıma düşür), bu tərəfdən də avam camaat avam mollaların təhriki ilə töküldülər ki, «sən burada bəni-növi-bəşərin başının sahibisən. Gərək qoymayasan ki, Qafqaz babiləri burada teatr oyunu gətirsinlər». Ağazadə axırda təngə gəlib götürüb rəisi-nəzmiyyəyə yazdı ki, «in qəbil hərəkat əz münkirat əst, misli-əməli Molla İsmayıl Həsənzadə ki, dər şəhri-Vladiqafqaz moizə və zikri-müsibətra füruxt be iraniyane-«Məməqan» besəd manat puli-əskinas və bu pulu alandan sora başlayıb yazıq həmşərilər ilə dava eləməyə ki, gərək mənim fayton pulumu da verəsiniz. Axır bilmirəm necə oldu.

A kişi, haradan başladıq, hara çıxdıq?

---

Qalanı da qalsın sabaha.

*Lağlağı*

---

## ŞAMAXI XALA

Gözünüz aydın olsun, Molla əmi!

Şamaxı xalanın bir oğlu oldu. Adını da qoydular «məktəb». Yəni Şamaxıda məktəbi açdıq. Proqramması-nın surəti-siyahisi bedin qərarəst:

Rövzəxanlıq müəllimi – məşhur rövzəxan Hacı Molla Salam.

Şümürxanlıq müəllimi – məşhur artist Şümürqulu.

Mövludxanlıq müəllimi – prixod mollası Əbülqasım əfəndi.

Fatihəxanlıq müəllimi – əməleyi-mövtadan Molla Əhməd.

Müdiri-məsul – Nə? Məsul? Bəli, məsul! Şeyxzadə.

Di indi rahat ol! Məktəb, məktəb! Bu da məktəb... Get əlini qoy başının altına, yıxıl rahatca yat!.. Rəhim allahi mən qare əlfatihə. Allah mübarək eləsin. Amin!

*Şeytan*

---

Müsəlman kontrabandçıları.

Xoş səadət, cənazələr




Bu gün İrana səyahət edənlər.

## ELAN

Bir kantorşik lazımdır:

Şümşadqədd, əbrukaman – siminbədən, şirinzəban fərbeh sərin, lağərmiyan – həm qır verən, həm can alan.

Savadlı olmasa da eybi yoxdur. Buxara üsulu ilə özüm təlim verərəm, ancaq yaşı on altıdan artıq olmasın.

Adres: Aşqabad, Seyid Ömər Xacə Nizamov Buxaralı.

## ZAQATALADAN

Alicənab Molla əmi!

Dünən bazar günü dükanda oturmuş idim. Bikarlıqdan qəlbim qaralıb sizin keçən illərin nüsxələrini başladım mütaliə etməyə.

Bu halda rəfiqim gəlib başladı mənimlə bərabərlikdə mütaliəyə. Bir qədər baxandan sonra rəfiqim dedi: «Bəs bu Molla Nəsrəddin hər bir yerdən, hər bir şəhərdən bir xəbər, ya bir şəkil çəkibdir, nə üçün bizim Zaqataladan bir əsər görülmür?» Dedim: «Rəfiq, Zaqatalada bir iş yoxdur ki, Molla Nəsrəddin onu yazsın». Rəfiqim dedi: «Nə üçün Naxçıvan övrətlərinin, toyçular naməhrəm deyib, oynamaqlarının təsvirini çəkir, amma bizim Zaqatalada müsəlman övrətləri çayçı dükanlarında oturub çaxır içməklərinin təsvirini çəkmir. Və nə üçün Zaqatalada müsəlmanlar hər ildə iki yüz qız götürüb qaçmaqlarını yazmır?» Dedim: «Rəfiq, Molla Nəsrəddin əgər bu sözü yaza, Zaqatalada olan bir para əfəndilər, qazilər çörəkdən düşərlər». Rəfiqim dedi: «Bəs nə üçün Tiflis müsəlmanlarının fahişəxananın hökumətə ərizə verib öz məhəllələrinə gəlməyini yazır, amma bizim Zaqatalada Akop Lalayevin dükanında olan fahişələri ermənilər şikayət edib Zaqataladan getməyini tələb etdik də bizim qeyrətli cavanlarımız işdən xəbərdar olub dərhal yüz nəfərdən artıq şəxslər qol çəkiblər ki, «biz fahişələrin Zaqatalada olmağını istəyirik və dübarə istəyirik», ya nə üçün Ağdaş qiraətxanasının naxoş olmağını yazır, amma bizim qiraətxanamız mərhum olmağı xüsusda bir təziyənamə yazmır, nə üçün Zaqatala şəhər işqolasında yeddi nəfər müsəlman şagirdi olmağını yazmır?»

Mən isə rəfiqimə bir cavab tapa bilməyib sizdən təvəqqe edirəm Zaqatalanı da arabir yadavər edəsiniz. Amma Molla əmi, təvəqqe edirəm Aslan bəy Qardaşov və pristav Hicran bəy Qardaşov evlərinə gedəndə küçədə palçıqdan və sudan çəkmələrini çıxarıb əllərinə almağını yazmayasan.

*Zaqatalnişin*

---

## DANOS VERƏNLƏR

Aşqabadda Müzəffəri işqolasını keçən il mollalar danos verib bağlatdılar; biçarə uşaqlar küçələrdə sərgərdan qaldı. Bu il genə Müzəffəri işqolasından danos veriblər, biçarə iranlılar qalıblar əmmaməli qoçuların əlində.

Danos verənlərin biri pəzəvəngüz-zakirin Hacı Miribrahim rövzəxandır, iranlı. Keçmişdə Aşqabadda palanduz idi, sonra «Dəxil» kitabını əzbərləyib oldu arvad mərsiyəxanı. Nə üçün arvad mərsiyəxanı oldu, onun da səbəbini özü yaxşı bilir. Çün mərsiyədən sora müsafihə savab olmağa görə arvadlar ilə görüşür, görüşəndə dəxi arvadların əlini sıxır və deyir ki, «siz də müsafihə eləyəndə, bacılar, bir-birinizin əlini sıxın, çün hədisdə varid olub: Fatimeyi-Zəhra əleyhissəlamın baş barmağında sümük yoxdur» və çox vaxt olur Hüseyn ağanın təziyəsində hazır olur.

Hərçənd bu boynuyoğunu iranlılar qovdular və onun moizəsini arvadlara qadağan elədilər, lakin bir para müstəbidlər genə onu gətirdib oxudurlar.

Danos verənlərin biri də soxulcanüz-zakirin Hacı Molla Abbasəlidir. Bu da müstəbid olmağına görə Təbrizdə döyəcək idilər. Bir ayaq da tülküdən borc alıb gecə oğlanları ilə qaçıb gəlib Aşqabada. İndi olub iranlıların taci-səri, mötəqidi və hökumət də istəyir bunu ölən qazinin yerinə təyin eləsin.

*Xortdan bəy*

---

## FELYETON

### (Hürriyyət, ədalət, müsavat)

1905-ci ildə oktyabr ayının 17-də hürriyyət elan olmuş idi. Hər kəsdə bir şövq, bir sürur, bir ideya, bir fəlsəfə, məslək və i.a.

Bu əsnada şəhərin əyan və əşrafından və dabbaq əğniyasından bir zat dari-bəqadan dari-fənaya rehlət eləmişdi. Məlum ola ki, mərhum axşamdan vəfat eləmişdi. Amma genə qəbristana günorta zamanı güc hal ilə yetişdi. Cənazəni şiddətli «abloka» alıb manatlıq əşər ilə mərhumu tamam bir saat bombardman elədilər. Və mərkəzdən verilən bir işarət ilə, cənazəyə bir hücum gətirib zərbəft, ağ, çit və i.a. qarət olundu, amma zavallı qəbirçi hala qazır. Ən nəhayət məzarçı təngə gəlib indolajans mərkəzindən sual elədi: Həzərat, zəhmət qəbul edib bir qəbrə baxın, mənim hesabımca, çoxdan tamam olubdur! Bu əsnada, qurban olduğum, topqaraqıç Hacı Abdulla əfəndi kəmali-vüqar ilə yerindən qalxıb qəbrə bir nəzər salıb o tərəfin, bu tərəfin təftişdən sora qəbirçiyə xitabən: «Hənfi qövlünə görə sağ cəhətdən bir kömlək alsan fəna olmaz!» Zavallı məzarçı genə başlayır qazmağa. Bir qədər qazdıqdan sonra təkrar genə sual edir: «Həzərat, bir az zəhmət qəbul edib bir qəbrə baxınız». Bu əsnada qurban olduğum Nurməmməd əfəndi kəmali-təzimü təkrim ilə qəbri nəzərdən keçirib məzarçıya xitabən: «Şafei qövlünə görə sol böyründən bir iki barmaq alınarsa, fəna olmaz zənn edirəm!» Zavallı məzarçı bu əvvəlkindən daha pürhiddət tamam yarım saat qazar, genə yorulduqda başlar sual eləməyə: «Zəhmət qəbul edib baxarmısınız?» Bu əsnada qurban olduğum Rəsul əfəndi qayət mütəvazianə yerindən qalxıb qəbrin eninə-uzununa diqqət edib qəbirçiyə xitabən: «Hənbəli qövlünə görə ayaq tərəfdən bir-iki qarış alınsa, tamamdır zənn edirəm!» Biçarə mə-

zarçı başlar genə qazmağa: nə iki, nə üç, nə beş, nə on və əlhasil mərkəzdən tamamdır əmri verilincə qazar. Ən nəhayət, təngə gəlib bu dəfə daha pürhiddət dedi: «Həzərat! Bir dəfəlik söyləyin ki, qızıl öküzə qədər qazılacaqdır, yoxsa belə şey olmaz». Bu əsnada nəfəsinə qurban olduğum Hacı Əhməd əfəndi qayət təzim və təkrim ilə qəbri-şərifi müayinə elədikdən sora məzarçıya xitabən: «Maliki qövlünə görə baş tərəfdən iki qarış qazılsa, gözəl olur, zənn edirəm». Nə isə bu səfər zavallı məzarçı o qədər qazar ki, ən nəhayət mərkəzdən «dur» əmri verirlər. Bu əsnada cənab Nurməhəmməd əfəndi təkrar yerindən qalxıb qəbri şiddətli bir müayinədən keçirib sora biçarə məzarçıya: «O yumşaq torpaqdan bir az başın altına töksən, həm sünnətdir, həm səninçün on haccın savabı yazılır». Biçarə məzarçı bu səfər cani-dildən onun buyurduğunu əmələ gətirib on haccın savabına nail oldu. Nə isə, mərhumu dəfn edəndən sora burada bir təlqin oxumaqlıq elədi ki, «ərşdəki xoruz və yeddi qat yerin altındakı öküz eşitdi desəm, xəta etməmiş oluram. Və məlum ola ki, təlqin iki nömrə ilədir: məsələn, xan, bəy, zəngin – bunlarınkı uzun tumar kimidir. Sora fəqir, rəncbər, gəda, kasıb – bunlarınkı bir əlboydadır. İştə hürriyyət, ədalət, müsavat, üxüvvət.

*Mabədi var*

**ELAN**

**Dörd otaqdan ibarət olan evimi verirəm icarəyə; ili altı yüz manata. Pulun üçdə birini qabaqca alıram və sınan şüşələrini özüm salıram. Xahiş edənlər bu adresə gəlsinlər, ya yazsınlar. Bu şərt ilə ki, icarəyə götürən müsəlman olmaya. O səbəbə ki, haman həyətdə övrət-uşaq var və bunlar da ki, tək bircə müsəlmanlardan qaçırlar.**

*İmza: Bakıda ev sahibi bir müsəlman*

**ŞƏKK**

Yəni, ay məlun, hər zada şəkk gətirdin, buna da şəkk gətirəcəksən? Yəni İsfahanda Ağayi Nəcəfiyə də şəkk gətirəcəksən ki, əvvəl axır dördcə yüz kəndi var? A kişi, Allahdan qorx, adamın ağzı əyilər. Gör necə əmindir ki, hər kəsin pulu olur, gətirir verir ağaya; necə ki, bir neçə adamlar verib öldülər, pulları səğirlər istəyəndə ağa istədi versin, istixarə elədi, bəd gəldi. Özü də iyirmi dörd arvad alıb, altmış iki də siğə eləyib. Hamısı şəridir və hər kəs də istəyir qurban olduğumun əlini öpsün, qoymur. Ağanın bir kəraməti də budur ki, hər kəs onun eşşəyinin quyruğundan bir tük çəkə və apara Taxta fulad qəbristanında yandıra, övrət olsa, uşağa qalar, kişi ölsə – başının keçəli yaxşı olar. Hər kəs inanmır, Tiflisdəki isfahanlılardan xəbər alsın və hətta bu günlər ki, millətdən ötrü ianə yığırdılar, ağa istixarə elədi, Allah-taala izn vermədi, bu da baş tutmadı.

*Molla Rzaqulu*

**CÜRBƏCÜR XƏBƏRLƏR**

Aşqabadda məşhur, müqəddəs Kəblə Şəkər Qarabağlı alnının təri ilə halal pul qazanır, həmişə əbasının altında qaçaq mal satır, özü də deyir ki, «Firudiniyyə, Müzəffəriyyə işqollarına uşaq qoyanlar kafərdirlər». Allahtaala Kəblə Şəkər əminin papağını saxlasın.

---

Aşqabadda rövzəpəz Hacı Mirələkbər iranlı deyir ki, «qurban o zamanlara ki, kəndlilər məni görəndə deyirdilər «budu həzrət Abbas gəlir». Hər nə də kefim istəyirdi, eləyirdim. Amma indi bu laməzhəb Molla Nəsrəddinin əlindən qəpiyə möhtac olmuşam».

---

Orenburq. Mollalar bu il Qurban bayramında Hüseyn Danskoy saxlayan müsəlman fahişəxanalarına gedib, fahişələrə imam olub bayram namazı qıldılar. Allah qəbul eləsin. Sonra fahişələrin halal pulu ilə alınan qoyunların başını kəsib ətindən dəxi hərəsi bir bud götürüb gəldilər.

---

Orenburq. Mömin qırğızlar Orenburq vağzalında camaat namazı qılanda üçüncü zvonok vuruldu. Vaqon hərəkət elədi, qırğızlar nə qədər bərkdən «Allahu əkbər» dedilər isə də vaqon dayanmadı.

---

**QAFQAZ XƏBƏRLƏRİ**

Şamaxı şəhər vəkillərini bu gün pristav polisaya çağırmışdı. Nə isə bunlar çox danışırlar. Birdən pristav ağa qalxır, bunlara tərəf gedir. Vəkillər elə xəyal eləyir ki, pristav bunları döyəcək və yazıqlar birdən özündən gedir. Yaxşıdı ki, Allah rast saldı, tez ayıldılar.

Və bir də təzə xəbər budur ki, dəllək usta Molla Əbdüləlinin bazarı yaxşı işləyir: gündə min baş qırxır. Afərin naxçıvanlı Hacı Molla Abdulla mərsiyəxanın ülgücünə ki, usta Molla Əbdüləliyə vəsiyyət eləyibdir. Allah rəhmət eləsin.

**MÜLKƏDAR**

İndi bir avropalıya desən ki, bizim mülkədar filan bəy, ya xan təzə bir iş başlayıb, avropalı elə xəyal eləyəcək ki, mülkədar təzə bir toxum yazıb gətirdib əkir, yainki təzə bir əkin maşinası işə salıb.

– Pəs mülkədar nəyə məşğuldur?

– İki ildir divanxanalarda və vəkillər yanında çalışır ki, qardaşının əlini mülkdən çıxartsın.

*Müdir və baş mühərrir: Cəlil Məmmədquluzadə*

Училишная комиссия при управе. Баку.

Bakı. Şəhər idarəsində məktəblər şöbəsi (uçilişnaya komissiya)




Storojc: Balam, nahaq yerə zəhmət çəkibsiniz: Əgər şamaxılı deyilsiniz, sizə yer verməyəcəklər, çünki komissiyanın sədri özü şamaxılıdır.
Сторожъ: – Напрасно надеетесь получить учительское место, если вы не шемахинцы..

ملا نصرالدين

№16 Qiymәti 12 qәpik. МОЛЛА НАСРЕДДИНЪ Цена 12 k. № 16




– Baba, tәzә konsul mәnәm, sәn nәçisәn?
– Olan, nә danışırsan, tәzә konsul mәnәm. Bu mәnim hökmüm ki, vәzarәti-xaricәdәn gәtirmişәm.
– Xeyr, xeyr, ağa, sәhviniz var, tәzә konsul mәnәm. Bu da mәnim hökmüm, mәn dә haman vәzarәti-xaricәdәn gәtirmişәm.

Litoq. S.Bıxova

## ƏDƏBİYYAT

«Dil mirəvəd zidəstəm,
Sahib dilan xudara,
Dərda ki, razi-pünhan
Xahəd şod aşikara*».

---

Asudəlik bu saət
Yerdən göyə cahanda
Var isə, vardır ancaq
İranda, hər məkanda:
Təbrizdə, Sərabda,
Xalxalda, Xançobanda,
Qeyrətli Şahsevəndə
Hər anda, hər zamanda.
Lorlarda, Şıxgözəldə,
Kaşanda, İsfahanda,
Tehranda, Əncüməndə
Kabnetdə, parlamanda
İşlər bütün həqiqət,
Sözlər bütün güvara.
«Dərda ki, razi-pünhan»
Xohəd şod aşikara».

Dalma təfəkküratə,
Qare ki, işbu halət,
Ya kimlərin gücündən
İranda etdi nəşət?
Əlyövm hər tərəfdən
Çarpır gözə şikayət.
Hər kəsdə vəcdü şadi,
Hər yerdə əmnü rahət.
Əhvali-daxiliyyə
Bilxeyrü vəs-sələmət
Dadü sitəddə rövnəq
Şirkətlə hər ticarət,
Xoşdil bütün camaət,
Razı bütün rəiyyət,
Asudə hali-millət,
Dair ümuri-dövlət,
Nəzmü nəsəq mühəyya,
Ləşkər bütün səfara.
«Dərda ki, razi-pünhan
Xahəd şod aşikara».

---

Zənn etmə haziranın
Səyilə bimühaba,
Bu rütbə etilalıq
Beş gündə oldu bərpa.
Yox, Yox! Xəta edirsən,
Haşa və sümmə haşa!..
Gərçi bular da az-çox
Bir iş görüblər, amma
Keçmiş binayi-xeyrin
Asarıdır həmana.
Qaib müdəbbiranın
Tədbiridir ki, hala
Etdikləri sədaqət
Bir-bir olur da peyda.
Açdıqları bulaqlar
Cari olur sərapa,
«Hatəssəbuhə həyyu,
Ya eyyühəssükara».
«Dərda ki, razi-pünhan
Xahəd şod aşikara».

***

Bunlar əbəsmi, yahu,
Məlulə yoxmu illət?
Himmətsizin olurmu
Bunca müvəffəqiyyət?
İran səadətində
Çoxlar edəndi xidmət.
Çoxlar bu məmləkətdə
Göstərdi səyü qeyrət.
Zan cümlə Nasirəddin,
Həqq eyləsin də rəhmət,
Hər beşdə-üçdə etdi
Hər səmtə bir səyahət.
Hər bir səyahətində
Sel tək axıtdı sərvət,
Yüksəldi ərşə qarşı
Xaki-diyari-Dara.
«Dərda ki, razi-pünhan
Xahəd şod aşikara».

---

İştə bunun üçündür
İranlı bilməsərrət,
Dünyalara axışdı
Olduqca gördü izzət (?)
Hər şəhri qıl tamaşa,
Hər səmtə eylə diqqət:
Məşriqdə minlər ilə,
Məğribdə bilizafət,
Türkiyyədə ziyadə,
Rusiyyədə nəhayət,
Çində, Xətada, bəh, bəh,
Həp aşinayi-qürbət.
Hər sudə bittəkəssür,
Hər kudə bizziyadət,
İranlıdır görürsən
Əmma nə şanlı röyət?!
Əmma nə dadlı didar,







---

**Ürək sahibləri, ay Allah,
Ürək əlimdən gedir.
Dərd budur ki, gizli sirrlər,
Aşkar olacaq. (Red. –T.K.)*

Əmma nə xoş qiyafət!
Hər şəxsə zahir ikən,
Yox ərzi-hala hacət.
Tərif üçün və bir də
Yoxdur dilimdə yara.
«Dərda ki, razi-pünhan
Xahəd şod aşikara».

---

Ha, indi də Əhəd xan,
Ol mənbəyi-ədalət,
Abadiyi-vətənçün
Min babi tabeiyyət,
Nasir tək etmək istər
İsbati-qədri-millət.
Bol-bol səyahətindən
Məqsudi məhz ibrət.
Cudü səxavətindən
Mən eyləməm hekayət.
Qoy madmazellər etsin
Tərifini nəhayət.
İranə bənzər olsun,
Qoy səfheyi-Buxara!
«Dərda ki, razi-pünhan
Xahəd şod aşikara».

*(...........)*

---

## KİMLƏRDİR

Kimlərdir rus qoşununu indiyədək İranda saxlayan? Mən deyəcəyəm – belə bizim başı əmmaməli müctəhidlərimiz və övladi-peyğəmbərlərimiz, amma sən deyəcəksən – yox.

Mən deyəcəyəm – hə!

Sən deyəcəksən – yox!

Bundan nə çıxacaq? Mən belə deyəcəyəm, sən elə deyəcəksən. Yaxşısı budur, əzizim, bir az hövsələni dər, mən nağıl edim, sən də qulaq as. Dəxi niyə ürəyini sıxırsan.

---

Bismillahir-rəhmanir-rəhim, xeyrətün minallahül əzizül həkim, lifilan binflan. İranı istəyən qardaşlara məlum olsun ki, rus vəziri-muxtarı Tehranda məclisi-məbusanə qəti surətdə vədə vermişdi ki, həmin ayın iyirmi beşində rus qoşunları İrandan çıxacaqlar. Əgər bir yanda iğtişaş-miğtişaş olmasa.

Yəni bircə şərt ilə – iğtişaş olmasa.

Çox əcəb! Yəni iğtişaş nə bir çətin işdir? Sən bircə iğtişaş deyirsən, amma əgər meylin çəkir, mən Rəşt kimi bir böyük şəhərə od vurum, həmi minlərcə övrət-uşaq od içində külə dönsün, həmi rus qoşununa genə İranda qalmağa bəhanə olsun.

---

Bu gözəl tədbiri tökən, bu planı çəkənlər olublar Rəştdə iki nəfər şəxs ki adları:

1) Rus təbəəliyini qəbul edən məşhur qazi Şəriətmədar,

2) Peyğəmbər övladı seyid Molla Məhəmməd.

Mənə həmişə deyirdilər ki, Nəcəfdə darülfünun qurtaran üləmamız və müctəhidlərimiz incinar dərsi də oxuyurlar, mən inanmazdım. Səbəbi budur ki, orada təhsil tapanların yüzdə doxsan doqquzu əllərinin barmaqlarını düz sayıb başa çıxa bilmirlər.

Amma söz yox, «hamı oxuyan Molla Pənah olmaz». Yəni insafən, ağayi-Şəriətmədar və seyid Molla Məhəmməd çəkdikləri plana baxanda insan deyə bilmir ki, bunlar incinar deyillər. Və Vladiqafqazın təzə konsulunun yerinə olsam, bu ağaları təklif edərəm Petrovsk şəhərinə ki, vaxtı tamam olmamış biletləri təzələməyə və Əncümənin palazlarını Qafqaza aparmağa plan çəksinlər ki, camaat mane ola bilməsin.

## RƏŞT YANĞINININ PLANI:

Ağayi-Şəriətmədar və ağayi-Molla Seyid Məhəmməd Rəşti yandırmaq üçün belə bir gözəl plan çəkmişdilər ki, şəhərə dörd tərəfdən od vurulsun və bu qəsdi əmələ gətirmək üçün xainlər üç dəstə olmuşdular. Əvvəlinci dəstədə iş görənlər bunlar idi: Sərdar Əmcəd, Şəriətmədar və Molla Seyid Məhəmməd. İkinci dəstə iş görənlər: Sabiqdə Rəşt mücahidi Seyid Abbas, faytonçu Muxtar maştağalı, faytonçu Məşədi Baqi və Cəfər. Üçüncü dəstə: İranın bikar adamlarından iki yüz veyl və bambılı.

Nə tövr olursa, haman gecə nəzmiyyə hakimi Siddiqülhərəm irticaiyyunların bu tədbirindən xəbərdar olur və bir neçəsini həbs edir, Molla Seyid Məhəmmədi göndərir Tehrana, amma Şəriətmədara bir söz deyə bilmir, çünki təzəlikdə rus rəiyyəti olubdur.

Xülasə, axırı xeyir oldu və hərçənd xainləri hakimi-nəzmiyyə tutub həbsə göndərmişdi, amma rus təbəəsindən Hacı Rüstəm Babayev gedib hamısını həbsdən qurtardı.

---

Mənim hərdənbir qulağıma belə bir söz çatır ki, guya Molla Nəsrəddin mollaları istəmir və söz axtarır ki, onlara dolaşsın.

Mən bunun cavabında ərz edirəm ki, səhərlər yerimdən duranda əbədən o xəyalda olmuram ki, bir mollaya sataşım, bir mollanı pisləyim.

Poçtadan kağızları alıb oxuyuram və görürəm ki, mollalar, seyidlər, şəriətmədarlar istəyirlər İranı yandırsınlar.

Bu xəbərləri də bizə yazanlar İranı dost tutan qardaşlarımız və xeyirxah müsəlmanlarımızdır.

## NƏ CÜR YAZMAYAQ?!

Yoxsa, bizim qəsdimiz o deyil ki, bigünah bəndələrin adını nahaq yerə çəkib onlara böhtan deyək. Axund Molla İsmayıl Həsənzadə Vladiqafqazda məscidin iki dükanını sahiblənib deyir ki, məscidin malı bircə mollaya halaldır, qeyrilərə yox. Bunu eşidəndə biz də götürüb yazırıq:

### MÜRƏBBE

Anın üçün uymaz qeyriyə könlüm
Bir əcəb molladır mənim sevdiyim.
Molla nədir, seyid nədir, mələkdir,
Hamıdan əladır mənim sevdiyim.

---




Molla kişi ilə oğlana qardaşlıq siğəsi oxuyur.
(Bir yolluq de ki, kəbin kəsir.)




Dəryayi-Urmiyyə.

Saqqalı sünbüldür, yanağı lalə,
Özü də bənzəyir vəhşi çaqqalə.
Qulaqları uzun, gözü piyalə,
Millətə bəladır mənim sevdiyim.

*Molla Nəsrəddin*

---

## MƏKTƏBİ-XƏMRİYYƏ

Quba mahalında aşağa Zəncur qəryəsində cənab Kamış yüzbaşının mərifəti ilə Hacı Rəsulun mənzilində bir məktəbi-xəmriyyə açmışıq ki, millətin balaları bu məktəbdə şərab içməyə uşaqlıqdan adət eləsinlər.

Yaşasın yüzbaşı, yaşasın Hacı Rəsul, yaşasın prixod mollası İbrahim əfəndi və cənab Hacı Ədil ki, məktəbi təbrik etməyə təşrif gətirmişdilər.

Yaşasın müsəlman qardaşlar!

---

## ORENBURQ XƏBƏRLƏRİ

Əmiri-Buxara Yaltadan övdət edərkən Orenburqda bir gün müsafir olub, bütün əhli-islamı şadü xürrəm elədi.

Təsadüf edən qaradovoy və kazakların boynuna medal və nişanlar taxdı. Başqalara da çox ənam, ehsan qılmış deyirlər.

Allah belə «müsəlman» əmirinə uzun ömür və Buxarada aclıqdan qırılan sartlara səbir versin! Amin!

Qasprinskinin 25 sənəlik yubilesi şərəfinə Orenburqda bir müsəlman «darülmüəllimin»i açmaq qəsdi ilə, bundan bir-iki sənə əvvəl şəhərin ziyalı və həyalılarından mürəkkəb bir komissiya intixab edilmiş idi. Böyük ictihad və pək çox uyğulardan son hindli Minhacın «darülfünunu» kimi az qaldı şu «darülmüəllimin» yapılacaq idi, fəqət komissiya vəfat etdi. Şimdi vəfat olmuş komissiya əzalarının şərəfinə yubiley yapılacaq.

***

«Tərcüman»ın düzdüyü plan üzrə Avropada ediləcək səyahətə iştirak etməyə buralı milyoner islamlara təklif olunmuş isə də bunlar belə cavab verdilər: «Biz axmaq deyiliz ki, kafər məmləkətinə gedib beş-altı yüz rublə para israf edəlim. O para ilə biz bütün gecəni «Dekadans» qabağında vur patlasın, çal oynasın aləmində keçirəcəyiz.»

---

## QAÇMAQ HÜNƏRDİR

Ravilər belə rəvayət edirlər ki, məşhur Koroğlunun yüz hünəri var idi, 99-u qaçmaq idi. Odur ki, bir şəxs istəsə ki, dünyada nam-şöhrət qazansın, gərək Koroğluya haşiyə düşsün, necə ki, Ləkit qəryəsində olan Şeyx Əbdülvahab əfəndi kimi.

Bu hərif də neçə illərdir Dağıstanın bir koyulundan çıxıb, Ləkit camaatını xoşbəxt eləmək üçün bu kəndə gəlib, avam camaatın köməyi ilə ev-eşik sahibi olub oturmaqla hələ şeyxlik də edir?!. Bunun bir yetim qardaşı qızı var imiş. Dörd il bundan müqəddəm məzkurəni vəlisi hesab olunan qardaşı İsmayıldan deyə-deyə razılıq alıb cibişdan xatirəsi üçün haman kəndli Hacı Mamay əfəndiyə nikah edir. Sora Hacı Mamay əfəndi vəfat edir. Sora genə qızın başına nə müsibətlər gəlir. Xülasə, Şeyx Əbdülvahab əfəndi biçarə qıza etdiyi zülmü əgər qoyaq tərəzinin bir tayına və bir tayına qoyaq bu günlərdə Tiflisdə doqquz yaşında ərə verilən bir qıza olunan zülmü və birəhmliyi, o vədə tərəzinin meyli İrəvan və Naxçıvanın kasıb bəylərinin qaməti kimi dümdüz durub heç bir tərəfə əyilməz.

Molla əmi! And verirəm səni vaizin doğru olan moizəsindən rəncidə olan Car bazarının qumarbaz mücahidlərinin imanlarına, Ləkit camaatından sual edəsiniz bu bədxasiyyət və bədşarval şeyxi haradan və nə növ ilə tutub gətiriblər?

*Sofi zənbil*

---

## DƏRBƏND

Bu Novruz bayramında yuxarı məhəllənin igidləri at çapanda bir övrət qəzadan qaçıb qurtara bilmədiyindən cavanların təsəddüqü oldu və bir neçə uşaq dəxi barıtdan, pistondan, taraqqadan, fişəngdən üzü-gözü yanıb şikəst oldu. İndi Molla əmi, bu gün aprelin on səkkizi qızıl yumurta bayramı olmağına görə dükan-bazar dəxi bağlı və mən də müsafir olduğumdan tamaşa xatiri üçün Dərbəndin rus və erməni hissəsinə gedib bir qədər gəzdikcə heç bir bayram əsər-əlaməti mən orada görmədim. Çünki nə at çapan var, nə tüfəng atan var, nə səs, nə küy. Guya ki, heç bayram deyilmiş. Məhz bir qədər rus və erməni təmiz libas və ağ əlcəklərdə kimi fayton ilə, kimi piyada bir-birisinin mənzilinə did və bazdid edirdilər. Həqiqət, hər zadın bir yaraşığı var, ölünün yaraşığı ağlamaq, toyunku oynamaq kimi bayramın da cürbəcür şərtləri və yaraşığı var, o da ki, müsəlmandadır. Bunlara baxıb xeyli əfsus edirdim. Qərəz ki, şükr olsun, hər bir aşın duzu, hər məclisin və hər millətin yaraşığı müsəlman.

---

## MÜJDƏ

Şamaxılılar, müjdə olsun ki, Seyid Məhəmməd Şirvani gəlir Şamaxıya.

Demək olar ki, şamaxılılar üçün ağanın təşrifi iki bayramdır: biri budur ki, dəxi bundan sora Şamaxıda yer tərpənməz, o səbəbə ki, haman öküz ki, qoşa şıllağa qalxıb yeri tərpədirdi, haman öküz dəxi sakit olacaq, çünki ağa minəcək öküzün belinə, yapışacaq buynuzlarından və qoymayacaq ki, dəxi tərpəşsin.

İkinci xoşbəxtlik də budur ki, Mirmehdi ağa bun-

dan sora dəxi bir az asudə olacaq. O səbəbə ki, Seyid Məhəmməd ağa köməkçi olacaq, onun macalı olmayanda bu onun yerini verəcək, bu məşğul olanda o bunun yerini verəcək. Xülasə, dal-dala verib cəmi şamaxılıları xoşbəxt edəcəklər.

Allah ömür versin.

*Cırcırama*

---

## ERMƏNİ BAYRAMLARINDA MÜSƏLMANLAR

Bu gün ki, aprel ayının 21 və 22-dir, Şərur uyezdində Vərməziyar, Ələkli, Xannıqlar və Baş Noraşendə səhər tezdən müsəlmanlar üzlərini yumamış hərə bir dəsmala altı-yeddi yumurta qoyub, yuxarıda zikr olunan erməni kəndlərinə üz tutub yumurta döyüşdürməyə, qumar oynamağa gedirlər. Otuz yaşında müsəlman uşağı on yaşında erməni uşağı ilə yumurta döyüşdürür və ermənicə deyir: «ya ar bahi ya dur bahim». Axşam çağı, maşallah, bığıburma müsəlmanlar keflənib erməni qonşularının əvəzindən əl tapançaya bir-birinin üstə hücum edib şadyanalıq edirlər. Vəssəlam.

*İmza: Mirzə Qulay*

---

## NİCAT

Qəzetlərdə müsəlman qardaşlar hər gün oxuyurlar ki, Bakıda «Nicat» cəmiyyəti var ki, hər bir maarif möhtacına nicat paylayır. Çox əcəb.

Axırda iş belə gətirdi ki, «Nicat» cəmiyyətinə bir yüngül işimiz düşdü. Götürüb bir kağız yazıb «Nicat» cəmiyyətindən bir cavab istədik.

Cavab gəlmədi... Genə yazdıq, genə cavab gəlmədi. Beş-altı kağız və iki teleqraf göndərib cavab almayandan sora Bakıda bir tanışımıza yazdıq ki, gedib «Nicat»dan bir əhvalat bilsin.

Dünən rəfiqimizdən bir belə kağız aldıq:

«Əzizim molla! Bizim dostluğumuz söz yox səmimidir və mən də xüsusən Mollanın yolunda xidmət etməyə həmişə hazıram və nə qədər müşkül işə məni vadar edəsən, müzayiqə edən namərddir. İstəyirsən, hökm elə gedim küçədə bir günahsız bəndəni vurum öldürüm, soruşsalar da nöşün vurdun, deyim: çox əcəb elədim.

Xülasə, mehriban Molla əmi, mənə hər nə buyurursan buyur, amma «Nicat» adı çəkmə, məni «Nicat»a tuş eləmə. Mənə deginən gedim yüz gün sənin üçün daş daşıyım, amma demə ki, «get «Nicat»dan bir kifayət al». Yox, yox, belə sözü mənə yazma, onsuz da bir səmər bağışlamaz. Əvvəla, yüz adam bir-birinin üstünə atacaq ki, «mən bilmənəm, filan ağa bilər» və saniyən, yüz gün də gözləsən burada verilən əhdə bir əməl nişanəsi görməyəcəksən».

Aman günüdür, Molla əmi, məni bağışla.»

*Nökəriniz: Dəmdəməki*

---

## MİLLƏTPƏRƏST

Mən biçarə hər gecə qatmaqarışıq yuxu görməkdən bağrım yarıldı. Axır əl mənim ətək sənin, bəlkə mənim üçün bir yuxu duası yazasan, bir qədər aram olam.

Bir neçə ay bundan qabaq gecə yuxuda gördüm: bir ağaca süvar olub, çiynimdə tüfəng dərya üzündə çapıram. Axırda gəldim Yekaterinodar şəhərinə. Yuxudan sərasimə ayılıb çoxlu səlavat dedim və şeytana lənət elədim və səhər çağı təbiri-xabə baxıb gördüm yazıb: at - ucalıqdır, tüfəng – səsdir, su da aydınlıqdır. Nagah haman gün küçədə gəzərkən Rəhim xanı gördüm və mən öz özümə dedim: Allah-taala axırın xeyir eləsin.

Və ondan bir ay sora genə yuxuda gördüm: mən bir meşəyə getmişəm və mənim dörd tərəfimi canavarlar alıb. Səhər dübarə təbiri-xaba baxıb gördüm yazıb: canavar – insanın düşmənidir. Mən çox Allah-taalaya şükr elədim və bir neçə gündən sora Mirzə Kərim xan cənabları bəünvani-konsul təşrif gətirdilər və millət ümumən müşarileyhi çox yaxşı pişvaz elədi. İnan ki, Təbrizdə Hacı Mirzə Həsən ağa elə pişvaz görməyib. Xülasə, bir neçə gündən sora elan oldu ki, hər kəs çün lazım və vacibdir gərək təzə təzkirə alsın və təzkirə qərarı felən 5 manat 20 qəpikdir. Biz cəsarət edib sərkardan xəbər aldıq ki, cəhət nədir bu il bir manat 20 qəpik artıq alırsız və sərkar acıqlı-acıqlı buyurdu:

Ey milləti-nadanü cahil, axır Məclisdən hökm olubdur, çünki millət çox dalı qalıb. İnşallah, bundan sora biz də sair millətlər kimi qabağa gələrik.

Yaşasın millət, yaşasın konsullar, yaşasın Təbrizdə qəhvəçi Qasım.

*İmza: İlana ağu verən*

---

## POÇT QUTUSU

Ağdamda dostumuza: «Millət dostları» imzasıyla yazılan təşəkkürnaməni biz də çap edə bilmənik.

---

Nuxada «M.P.» imzası ilə məktub göndərənə: Abunənizin nömrəsini nişan vermədiyiniz səbəbindən məktubunuza etina olunmadı.

---

Şamaxıda «Bir nəfər tələbə»yə: Yazırsınız ki, təzə açılan məktəbdən bir nəfər xaric olan müəllimin dörd nəfər təyin olunanlardan mahir olmağı izhəri-minəşşəmsdir. İstər «izhəri-minəşşəms, istər izhəri-minəl-qəmər» olsun, sizi tanımasaq, inana bilmənik.

***Müdir və baş mühərrir: Cəlil Məmmədquluzadə***



Такъ для чего же купить дорогой билет.

– Ədə, dəli deyilsən ki, baha bilet alırsan?.. Bir pərdədən sora keç otur lap əvvəlimci cərgədə.



Первое действие.

Əvvəlimci pərdə.




Второе действие.

İkimci pərdə.

Въ театре.

Müsəlman teatrı.